İMADƏDDİN NƏSİMİ

# SEÇİLMİŞ ƏSƏRLƏRİ

İKİ CİLDDƏ

I CİLD

"LİDER NƏŞRİYYAT"
BAKI-2004

*Bu kitab “**Nəsimi. Seçilmiş əsərləri**” (Bakı, Azərnəşr, 1973) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni: **Həmid Araslı**

Redaktor və
lüğətin müəllifi: **Teymur Kərimli**

**İzahların müəllifi: M.A.Məhəmmədi**

**894.361’1 - dc 21**
**AZE**

**İmadəddin Nəsimi**. Seçilmiş əsərləri. İki cilddə. I cild. Bakı, “Lider nəşriyyat”, 2004, 336 səh.

Kitaba böyük Azərbaycan şairi İmadəddin Nəsiminin (1369-1417) doğma dilimizdə əsasən lirik tonda qələmə alınmış qəzəlləri daxil edilmişdir. Ədəbi dilimizin formalaşmasında mühüm rol oynamış bu şeirlərdə insane gözəlliyinin tərənnümü, lirik aşiqin qəlb çırpıntıları aparıcı yer tutur.

**ISBN 9952-417-16-9**

Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

# ÖN SÖZ

Altı yüz ildir ki, böyük Azərbaycan şairi İmadəddin Nəsiminin adı Yaxın Şərqdə mərdlik, fədakarlıq və iradə rəmzi kimi hörmətlə çəkilir.

Altı yüz ildir ki, məsləki uğrunda dara çəkilib dərisi soyulan, son nəfəsində belə öz sözündən dönməyən bu mərd insanın faciəli ölümü şairlərin şerində, aşıqların sazında tərənnüm edilir.

Nəsimi Azərbaycan dilində şerin ilk gözəl nümunələrini yaradan, öz mütərəqqi fikirlərini yüksək bədii dillə ifadə etməyi bacaran qüdrətli sənətkarlardan biri olmuşdur. Onun ana dilindən başqa ərəb və fars dillərində də yaratmış olduğu divanlar şairin adının öz vətənindən çox-çox uzaqlarda, bütün Yaxın Şərqdə şöhrətlənməsinə səbəb olmuşdur.

Şairin əsil adı Əlidir. O, 1369-cu ildə Şamaxı şəhərində doğulmuşdur. Atası Seyid Məhəmməd dövrünün tanınmış adamlarından olmuşdur. Seyid Əli ilk təhsilini Şamaxı şəhərində almış, sonralar biliklərini daha da təkmilləşdirmiş, xüsusən fəlsəfi və dini cərəyanları öyrənməyə həvəs göstərmişdir. O, Nizami, Xaqani, Məhsəti, Fələki, Zülfüqar Şirvani, Arif Ərdəbili, Mahmud Şəbüstəri və Marağalı Əvhədinin əsərləri ilə tərbiyələnmiş, eyni zamanda Yaxın Şərqin görkəmli şairlərinin: Cəlaləddin Rumi, Rudəki, Sədi, Əttar və başqa klassik şairlərin əsərlərini dərindən öyrənmiş, özü də kiçik yaşlarından şeir yazmağa başlamışdır.

Yaxın Şərqin Şeyx Mahmud Şəbüstəri, Cəlaləddin Rumi, Marağalı Əvhədi kimi görkəmli şairlərinin panteist fikirləri daha geniş yayılırdı.

Şərq panteistlərinin özləri də müxtəlif qollara ayrılaraq öz görüşlərini təbliğ edirdilər. Gənc Nəsimi hələ mədrəsə tələbəsi ikən Şərqdə gedən bu ideya mübarizəsini izləməyə başlayıb, “ənəlhəq” dediyi üçün X əsrdə Bağdad şəhərində dara çəkilmiş Həllac Mənsur Hüseyninin təriqətini daha çox bəyənmiş, eyni zamanda Ərdəbildə geniş təbliğat aparmaqda olan Şeyx Səfi canişinlərinin görüşlərinə rəğbət bəsləmişdir. Məhz buna görə də o, ilk şeirlərini Hüseyni təxəllüsü ilə yazmışdır. Bu zaman Teymurun orduları Yaxın Şərqi istilaya başlamış və əsrin sonlarına doğru Azərbaycanı da özünə tabe etmişdi.

Bununla əlaqədar Yaxın Şərqdə yeni bir təriqət – şəhər sənətkarlarının görüşlərini ifadə edən hürufilik geniş yayılmağa başlamışdı. Şairin atası Seyid Məhəmməd qardaşı Seyid Hüseynlə birlikdə o zaman Şirvanda da yayılmaqda olan hürufilərə rəğbət göstərmiş, Fəzlullah Nəimi ilə şəxsən tanış olan bu ailənin bütün üzvləri hürufi görüşlərinin Şirvanda yayılmasında müəyyən rol oynamışlar.

Hürufiliyin əsasını qoyan təbrizli Fəzlullah Nəimi bu təriqətin nəzəri əsaslarını özünün "Cavidannamə", "Məhəbbətnamə", "Növmnamə" kimi əsərlərində şərh edərək geniş təbliğə başlamışdır. 80-ci illərin axırlarında Fəzlullah Nəimi Şirvana gəlmiş, Bakı şəhərində məskən salaraq tərəfdarlar toplamağa başlamışdır. Fəzlullahın "Vəsiyyətnamə"sindən aydın olur ki, Bakının mötəbər ziyalıları, tacirləri və dövlət adamları Fəzlullahın görüşlərini bəyənmiş, onun tərəfinə keçərək hürufiliyi qəbul etmiş və bu şəhər bir növ hürufiliyin təbliğ ocağına çevrilmişdi. Buraya bir çox yerlərdən hürufilər gəldiyi kimi, Yaxın Şərqin müxtəlif ölkələrinə hürufi təbliğatçıları da göndərilirdi. Bu dövrdə Fəzlullahla tanış olub, onunla görüşən Nəsimi hürufi görüşlərini qəbul etmiş və çox ehtimal ki, bu dövrdən etibarən şerlərini "Nəimi" sözü ilə səsləşən Nəsimi təxəllüsü ilə yazmağa başlamışdır.

Lakin hadisələr hürufilərin arzuladığı kimi getmir. 1394-cü ildə Fəzlullah öz tərəfdarları ilə birlikdə Şirvanda olduğu zaman Teymurləngin oğlu Miranşahın göndərdiyi dəstə tərəfindən həbsə alınaraq Naxçıvan yaxınlığındakı Alınca qalasına aparılmış və orada vəhşicəsinə edam edilmişdir. Bu zaman Fəzlullahın yazıb göndərdiyi "Vəsiyyətnamə" yə əsasən onun Bakıda yaşayan ailə üzvləri və tərəfdarları öz görkəmlərini dəyişərək tez bir zamanda buradan uzaqlaşmışlar. Çox ehtimal ki, Nəsimi də Fəzlullahın qızlarından biri ilə evlənərək ilk əvvəl İraqa, sonra Türkiyəyə getmiş, uzun müddət Anadolu şəhərlərini gəzərək hürufi ideyalarını təbliğ etmiş və nəhayət, Hələb şəhərinə gəlib orada məskən salmışdır.

Hələb o zaman mərkəzi Misir olan məmlüklərə tabe idi. Bu şəhər Şərqlə Qərb arasında mühüm görüş məntəqəsi kimi böyük ticarət əhəmiyyətinə malik idi. Hindistan və Şirvandan gələn böyük ticarət karvanları burada görüşür və dəniz yolu ilə Avropa şəhərlərinə gedirdilər. Hələb öz iqtisadi əhəmiyyətini Teymurun hücumundan sonra da saxlayırdı. Tarixi mənbələrdən aydın etmək olur ki, bu zaman Şirvandan

gətirilən ipəkdən Suriya şəhərlərində gözəl parçalar toxuyurdular. Şirvan ipəyi Hələb yolu ilə Avropaya da aparılırdı.

Nəsimi Hələb şəhərinə gəldikdən sonra ətrafına tərəfdarlar toplayıb hürufi ideyalarını yaymağa başlayır. Elə buna görədir ki, şairin həyatı üçün narahat olan qardaşı Şah Xəndan (qəbri Şamaxı şəhərindədir) ona müraciət edərək ehtiyatlı olmağı tapşırır. Ancaq öz iradəsində dönməz olan şair:

Dəryayi-mühit cuşə gəldi,
Kövnilə məkan xüruşə gəldi.
Sirri-əzəl oldu aşikara,
Arif necə eyləsin müdara?

misraları ilə başlayan məsnəvi ilə cavab verərək mübarizəni dayandırmayacağını bildirir.

Lakin Misir məmlükləri və Hələb ruhaniləri şairi dinsizlikdə günahlandıraraq 1417-ci ildə Hələb hökmdarının əmri ilə zindana salırlar. Az keçmədən şəhər ruhanilərinin məclisində şair mühakimə edilib, ölümünə fitva verilir.

Bir qədər sonra şəriət məhkəməsinin sənədləri ilə tanış olan Misir sultanı Əl-Müəyyəd şairin diri-diri dərisinin soyulub, yeddi gün Hələb şəhərində hamıya göstərilməsi haqqında əmr verir. Beləliklə, Nəsimi faciəli bir şəkildə edam edilir. Şairin zindan günlərində həbsdə yazdığı cəsarətli şeirləri, mühakimə zamanı mərdanə davranışı, məntiqi cavabları, mətin iradəsi uzun müddət xalq arasında danışılmış, əfsanə kimi dillərdə, ağızlarda söylənmişdir. Bu səbəbdəndir ki, Nəsimi haqqında bir sıra rəvayətlər yaranmışdır. İllər keçdikcə şairin həqiqi tərcümeyi-halı da bu rəvayətlərə qarışaraq əfsanələşmişdir. Xüsusən şairin ölümü haqqında bir-birindən fərqli rəvayətlər mövcuddur. Bunların birisində Nəsiminin edamı belə təsvir edilir:

“Bir gün Hələb şəhərində gənc bir hürufi Nəsiminin bir şeirini uca səslə oxuyurmuş. Gənci həbsə alırlar. O, şeiri özünün yazdığını söyləyir. Ruhanilərin fitvası ilə onu dar ağacından asılmağa məhkum edirlər. Hadisədən xəbər tutan Nəsimi özünü cəza meydanına yetirib, şeirin müəllifi olduğunu bildirir. Ruhanilər onun hürufi mürşidi olduğunu öyrənib, diri-diri soyulmasına fitva verirlər. Dərisi soyularkən qan itirən şairin saraldığını görən ruhanilər istehza ilə soruşurlar:

– Sən ki həqsən, bəs niyə rəngin sarıdır?

Nəsimi:

– Mən əbədiyyət üfüqlərində doğan eşq günəşiyəm. Günəş batanda saralar, – deyə cavab verir.

Bu rəvayətdə belə bir qeyd də var ki, guya şairin ölümünə fitva verən ruhani demişdir:

– Bu o qədər məlundur ki, onun qanından hara düşsə kəsib atmaq lazımdır.

Təsadüfən şairin qanından bir damcı həmin ruhaninin barmağına sıçrayır. Camaat ondan barmağının kəsilməsini tələb edir. O isə

– Mən sözgəlişi demişəm, – cavabını verir. Bu zaman al qan içində olan şair:

Zahidin bir barmağın kəssən dönüb həqdən qaçar,
Gör bu gerçək aşiqi sərpa soyarlar ağrımaz – deyərək ölür.

* * *

Nəsimi özündən sonra zəngin bir irs qoyub getmişdir. Dahi Azərbaycan şairi Nizami Gəncəvinin Yaxın Şərq ədəbiyyatına gətirdiyi humanist ideyaları davam və inkişaf etdirən böyük sənətkar insana, insan ləyaqətinə, onun qüdrətinə olan yüksək inamını tərənnüm edərək şeirlərində insanı həyatın yaradıcısı, həyati gözəlliklərin əsil mənbəyi kimi vəsf etmişdir.

Şairin qabaqcıl ideyaları dövrün mürtəce ruhaniləri tərəfindən şiddətli müqavimətə rast gəlirdi. O, allahsızlıqda ittiham olunur, panteist fitkirləri yanlış izah edilirdi. Məhz buna görə də Nəsimi dini ifadələrdən geniş istifadə yolu ilə fikirlərini yaymağa çalışırdı. O öz şeirlərində birinci növbədə cahil insanları tənqid edir, həyat gözəlliklərindən ilham almağa çağırırdı.

Onun istər didaktik, istərsə də məhəbbət mövzusunda yazılmış şerləri, təbiət təsvirlərinə həsr olunmuş əsərləri oxucuların estetik zövqünü oxşayır. Şair eyni zamanda hakim təbəqənin zülm və ədalətsizliyini, istilaçıların qarətçiliyini və onlara xidmət edən ruhanilərin satqınlığını göstərən əsərlər də yaradırdı. O, müasirlərini həyat və kainatın sirlərini öyrənməyə, biliyə, mövcud qanun-qaydalara açıq gözlə baxmağa çağırır, onları qəflət yuxusundan oyatmaq istəyirdi. Şairin hər üç dildə yazılmış şeirləri bədii cəhətdən sənətkarlıqla işlənmişdir.

Xüsusən onun ana dilində yazdığı əsərlər bütün türkdilli xalqlar üçün nümunə ola biləcək yüksək poetik bir üslubda qələmə alınmışdır.

Bir çox başqa klassiklərimiz kimi Nəsimi yaradıcılığının, şairin bədii irsinin ölməzliyi – hər dövrdə kəsb etdiyi yeni ictimai-fəlsəfi məzmun və yüksək sənətkarlığı ilə bağlıdır. Mistikadan və xurafatdan uzaq olan bu günkü oxucu üçün Nəsiminin hürufi ideyaları, əbcəd hesabı ilə müxtəlif manipulyasiyalar aparmaq yolu ilə Quran ayələrini insan üzü ilə eyniləşdirmək cəhdləri deyil, şairin qabaqcıl humanist görüşləri, poetik obrazlarının təzə-tərliyi, orijinallığı, Nəsimi sənətinin yüksək estetik təsir qüvvəsi, Nəsimi dilinin ritmikası daha çox maraqlı və cəlbedicidir. Altı yüz il öncə yaşayıb yaratmasına baxmayaraq,

Nəsimi bizim indiki ədəbi dilimizdən cüzi fərqlənən bir dildə danışır, öz xələfləri ilə söhbət edir. Bu isə Qazi Bürhanəddin, Həsənoğlu, Xətai, Füzuli, Vaqiflə birlikdə Nəsiminin də çağdaş ədəbi dilimizin yaradıcılarından biri olduğunu, bu dilin beşiyi başında öz "quş dili" ilə şirin layla çaldığını göstərməkdədir.

İndiki oxucu yalnız şərhlərdən və elmi əsərlərdən anlayır ki, böyük şairimiz

Dün gecə bir dilbər ilə eyşimiz mə'mur idi,
Lakin ol xunxarə gözlər uyxudan məmur idi.
Həmnişin idi Nəsimi dün gecə bir yar ilə,
Könlü şadü vəxti xürrəm, məclisi pürnur idi.

deyərkən "dilbər" sözü altında öz müəllimi və mürşüdü Fəzlullah Nəimini nəzərdə tuturmuş. Əslində bu gün həmin kontekst məna və mahiyyətini tamamilə itirir və yalnız tekst qalır: oxucunun gözü qarşısında iki sevgilinin görüşüb danışdığı əsrarəngiz bir gecə və gecənin yüksək sənətkarlıqla tərənnümü canlanır.

Nəsimi sənəti bütövlükdə insan gözəlliyinə, insan qüdrətinə heyranlıqla dolu bir himn kimi səslənir. Ancaq bu gözəllik, bu qüdrət dünyada bütün insanlara deyil, yalnız özünü tanımış, dərk etmiş kamil insanlara xasdır. Məhz buna görə şair kamil insanı "canımın cananəsi" adlandırır, ona səcdə etməyin vacib olduğunu göstərir. Kamil insanın gözəlliyinə səcdə etməyənlər, onun qarşısında heyranlıq hissi keçirməyənlər isə, şairin fikrincə, haq yolundan azmış div, şeytan və qanmaz heyvanlardır. Ancaq humanist şair bu şər qüvvələrin məhv edil-

məsinə hökm vermir, əksinə, islah, tərbiyə yolu ilə onların özlərini tanımasına, insan olduqlarından qürur duymalarına çalışır. Nəsimi ədəbi irsinin bu gün belə aktual olmasının səbəbi də məhz insanı kamilliyə, vəhşi instinktlərdən əl çəkməyə, şər əməllərə səsləyən “nəfsi-əmmarədən” (əmredici ruhdan – şeytandan) uzaqlaşmağa səsləməsidir. Bu gün də insanlar öz nəfslərinin ucbatından öz qardaşlarına zülm edir, onların bədbəxtliyinə laqeyd qalırlarsa, hətta bəzən bu bədbəxtlikdən patoloji ləzzət alırlarsa, deməli, Nəsimi sənəti yaşayır və humanist ideyaların təntənəsi uğrunda mübarizədə tərəqqipərvər bəşəriyyətin havadarı, silahdaşı kimi çıxış edir.

Əgər Nəsimi sənətindəki dərin humanizm qlobal-bəşəri mahiyyət daşıyırsa, onun yüksək poetik sənətkarlığı, dilinin şirinliyi və axıcılığı, heyrətamiz poetik ritmikası öz doğma xalqına xidmət edir, onun estetik zövqünün kamilləşməsində başqa klassiklərimizlə çiyin-çiyinə gedir. Xüsusən xalq dilinin üslubi-qrammatik imkanlarından yaradıcı şəkildə bəhrələnməkdə Nəsimi şeri misilsiz, taysız, bərabərsizdir.

Rəqib məndən sorur: nəndir sənin yar?
Rəfiqimdir, həbibimdir – nəm olsun!

Rəqibin istehzalı, kinayəli, tikanlı sualına bu cür sərras, səlist və şirin cavabı ancaq Nəsiminin lirik qəhrəmanı verə bilərdi.

* * *

Nəsimi əsərləri Yaxın Şərqdə geniş yayılmasına baxmayaraq bu vaxta qədər bütövlükdə toplanıb mükəmməl şəkildə nəşr edilməmişdir.

Doğrudur, onun əsərləri ilk dəfə 1844-cü, sonra isə 1871 və 1880-ci illərdə Istanbulda çap edilmişdir. Bu nəşrlərin əvvəlində şairin fars dilində şeirlərindən də nümunələr vardır.

Azərbaycanda isə görkəmli ədəbiyyatşünas Salman Mümtaz 1926-cı ildə Nəsimi divanını ərəb əlifbası ilə nəşr etmişdir. Bu nəşrlər Nəsimi irsinin geniş yayılmasında mühüm rol oynasalar da, böyük sənətkarın əsərlərini tamamilə əhatə etməmişlər.

Şairin ana dilində divanının elmi-tənqidi mətnini ilk dəfə Azərbaycan alimlərindən C.Qəhrəmanov nəşrə hazırlamışdır. O, Bakı, Leninqrad və İrəvan əlyazmaları fondlarında saxlanılan beş nüsxəni İstanbul və Bakı nəşrləri ilə tutuşduraraq şairin ana dilində əsərlərinin ilk elmi-tənqidi mətnini ərəb əlifbası ilə nəşr etdirmişdir.

Hüseyn Əyan da Nəsimi divanını çapa hazırlamışdır. O, istifadə etdiyi əlyazmalardan ikisinin fotosurətini bizə göndərmişdir (hər iki əsərin fotosurətini Nizami adına Ədəbiyyat Muzeyinə vermişik).

Nəsimi irsi son dərəcə təhriflərə uğramışdır. Hər şeydən əvvəl, böyük şairin davamçıları hürufiliyin ciddi təqib olunduğu illərdə Nəsimi divanının üzünü köçürərkən onları müəyyən dərəcədə dəyişdirmək məcburiyyətində qalmışlar. Nəsiminin müxtəlif ölkələrdə, müxtəlif zamanlarda yazdığı şerlərinin hamısı divanına düşə bilməmişdir.

Bütün bunlar son dərəcə istedadlı, orijinal üsluba malik olan novator sənətkarın zəngin irsinin çeşidlənməsinə, müxtəlif variantlara düşməsinə səbəb olmuşdur. Biz şairin elə beytlərini görmüşük ki, bir əlyazmasında o birisindən fərqli şəkildə yazılmışdır. Şübhəsiz ki, burada Nəsimini islah etmək istəyən və bəzən onun işlətdiyi ifadələri başa düşməyən katiblərin də az rolu olmamışdır.

Bundan əlavə şairin əsərlərinin üzünü köçürən özbək, türkmən və türkiyəli katiblər də onun dilini az dəyişdirməmişlər.

Məhz buna görə də əsəri nəşrə hazırladığımız zaman şairin ən qədim əlyazmalarından olan Ankara Dil və Tarix-coğrafiya fakültəsi kitabxanasında olub, əsli indi itmiş əlyazmanın fotosurətindən istifadə etmişik. XVI əsrin əvvəllərində yazıldığı təxmin edilən və Azərbaycan MEA Əlyazmalar Institutunda saxlanılan hərəkəli nüsxəni əsas götürərək Topqapı nüsxəsilə müqayisə yolu ilə hazırladığımız bu nəşr Nəsimi şeirlərinin nisbətən daha etibarlı sayılan nüsxələri əsasında ərsəyə gəlmişdir.

Divanın iki cilddə tərtibi zamanı Həmid Araslının 1973-cü ildə nəşr etdirdiyi Nəsimi əsərləri əsas götürülmüş, burada aparılmış bölgünün saxlanması məqsədəuyğun sayılmışdır. Nəsimi yaradıcılığında bol-bol istifadə edilən Quran ayələri və ərəb sözlərinin apostrofsuz yazılışının bir sıra anlaşılmazlıqlara gətirib çıxaracağı nəzərə alınaraq indiki orfoqrafik qaydalarda öz əksini tapmayan apostrof işarəsinin saxlanması da mətnin dəqiq anlaşılması üçün zəruri hesab edilmişdir.

***Həmid Araslı***
***Teymur Kərimli***

Mərhəba, xoş gəldin, ey ruhi-rəvanım, mərhəba!
Ey şəkərləb yari-şirin, laməkanım, mərhəba!

Çün ləbin cami-Cəm oldu nəfxeyi-Ruhülqüdüs,
Ey cəmilim, ey cəmalim, bəhrü kanım, mərhəba!

Könlümə heç səndən özgə nəsnə layiq görmədim,
Surətim, əqlim, üqulim, cismü canım, mərhəba!

Ey mələk surətli dilbər, can fədadır yoluna,
Çün dedin ləhmikə ləhmi, qanə qanım, mərhəba!

Gəldi yarım naz ilə, sordu, Nəsimi, necəsən?
Mərhəba, xoş gəldin, ey xırdadəhanım, mərhəba!

Şol ləbi şirinə, yarəb, gər şəkər dersəm, nola?
Şol günəş təl'ətli ayə gər qəmər dersəm, nola?

Adəmi növ'ində mislin görmədi dövri-fələk,
Şol cəhətdən gər sana xeyrül-bəşər dersəm, nola?

Şol gül üzrə dağılan ənbər sifətli sünbülə,
Ənbərin reyhan, əcəb, ya mişki-tər dersəm, nola?

Bilməyən eşqin təriqin hər xəbərsiz qafilə,
Çün hidayət bulmamış, gər bixəbər dersəm, nola?

Sənsiz, ey cani-cahan, bir pula dəyməz kainat,
Heçə dəyməz nəsnəyə gər şol qədər dersəm, nola?

Gər üzün ayın görənə, ey cahanın fitnəsi,
Şübhəsiz həqqi görən sahibnəzər dersəm, nola?

Kim ki, həqqi pərdəsiz üzündə, ey can, görmədi,
Bibəsirətdir, gər ana bibəsər dersəm, nola?

Zülfü rüxsarındır, ey can, sureyi-nurü düxan,
Gər bu mə'nidən ana şamü səhər dersəm, nola?

Nuri-imandır cəmalın – kim ki, səddəqna deməz,
Kafirü müşrikdir ana div əgər dersəm, nola?

Çün Nəsiminin məqamı Qaf imiş ənqamisal,
Şol müəllaqədrə gər ari göhər dersəm, nola?

Nuri-təcəlli şö'ləsi düşdü əzəldən alına,
Gözlərimin bu rəng ilə yaşı boyandı alına.

Həm mö'cüzati Əhmədin gözləri sehridir anın,
Rəhməti-həq bu cadunun ümmətinə vü alına.

Cəhd edərəm ki, alinə könlümü verməyəm, vəli,
Həm bilirəm ki, aqibət alinə könlüm alına.

Kimsə əgərçi istəməz düşməgi fitnəyə, vəli,
Şükr edirəm ki, düşmüşəm alə gözünün alına.

Düşdü Nəsiminin başı zülfü kimi ayağına,
Düşəli can gözü anın bədri-müəmməm alına.

Aşiq bəla yolunda gərək kim, həmul ola,
Mə’şuqədən ana nə gəlürsə, qəbul ola.

Gerçək mühibbə cövrü cəfa çünki yar edər,
Neyçün cəfadən incinə, qəmdən məlul ola?

Nazü nə’imü işrəti-cavid içindədir,
Dilbərdən ol könül ki, muradı hüsul ola.

Hər aşiqin ki, yar ilə oldu çeravü çün,
Arif qatında adı anın bülfüzul ola.

Şirin həlavət ol yemiş imiş ki, sidrəsi,
Zatında xub xilqətü şirinüsul ola.

Yoxdur nəsibi eşqi-həqiqətdən, ey könül,
Şol kimsənin ki, mürşidi naqisüqul ola.

Ey xaliqin əmanətini zaye’ eyləyən,
Layiqdir ada ol ki, züluмən-cəhul ola.

Gər şərh edərsəm ayəti-hüsnün kitabını,
Hər bab içində fəslinə yüz min füsul ola.

Me’racə çıxdı ruhi-Nəsimi Buraq ilən,
Şol laşədən nə faidə kim, la-zəlul ola?

Vəchində peydadır sənin ənvari-zati-kibriya,
Ol nurə qarşı daima şərməndədir şəmsüzzüha.

Leyli cəmalından cüda Məcnun kimi sərgəştəyəm,
Fərhadivar istər könül Şirin dodağından şəfa.

Cami-müsəffadən mənə saqi içirdi bir qədəh,
Sufi nə bilsin mən necə ol camdən buldum səfa.

Hər kim ki, tövhid əhlidir, ol didü vadid əhlidir,
Ruzi-əzəldən ta əbəd istər kəmali-müntəha.

Eynəl-yəqin həq sirrinə idrak edən insan mənəm,
Ey mə'rifətdən bixəbər, insafa gəlgil, biriya.

Canı, cahanı sənsizin neylər Nəsimi xəstədil,
Səndən müdam ehsan umar, çün kim, gədadır binəva.

Hər kim ki, baxa bir dəm dilbər qaşı yasına,
Navəklərinə qarşu ya can tuta, ya sinə.

Derdim sənə, ya naseh, yar tərkin edə bilmən,
Bil doğru bu sözümnü, sınamavü ya sına.

Bimari-qəmi-eşqin timar ilə önülməz,
Yərəb, nola bir sorsan bu haləti-yasina.

Daş alubani dilbər, könlüm şişəsin atar,
Qarşu tutaram, şişə bilməm qala ya sına.

Qaşı yayını qurmuş, qanımı tökər billah,
İnanmaz isən baxgil qolları boyasına.

Məhbubi-dilaramsan bir bax mana sən, yarəb,
Yarəb, dilərəm səndən bu sureyi-Yasinə.

Xəstə Nəsimi, yarın əhvalını heç sormaz,
Sormağına çün gəlməz, barı gələ yasına.

Başını top eyləgil, gir vəhdətin meydanına,
Ey könül, müştaq isən gər zülfünün çövkanına.

Aşiqin qanilə oynar dilbərin simin əli,
Ey yalançı aşiq, əbsəm, girmə canın qanına.

Çəkməyən eşqin bəlasın, görməyən hicrin qəmin,
Dərdi dərmansızdır anın, çarə yox dərmanına.

Canını qurban edəndir yar içün gerçək şəhid,
Səd həzaran rəhmət olsun ol şəhidin canına.

Zülfünün sirrin nə bilsin zahid, anı sor mana,
Gər əsir olmaq dilərsən zülfi-canəfşanına.

Gəl niqabın tərfini gülgün yanağından götür,
Ta gülüstan gülməsin ayruq güli-xəndanına.

Xubların bağında çoxdur fitnəli nərgis, vəli
Fitnəlik xətm oldu anın nərgisi-fəttanına.

Lə’lü mərcandır dodağın, lö’löi-dürdür dişin,
Afərin şol bəhri-kanın lö’löi-mərcanına.

Kirpiyin navək oxudur, qaşların çaçi kəman,
Uğramaz aşiqdən özgə şol oxun peykanına.

Ey Nəsimi, gər sözün mə’nisi bipayan deyil,
Neçin irməz kimsənin fikri onun payanına.

Ey Məsihadəm, niyşə can vermədin cansızlara?
Ol ki, hər dəm can ilə aydır ki, canan sizlərə.

Ləblərin abin məni-diltəşnədən qılma diriğ,
Nola dərman eyləsən bu dərdi dərmansızlara.

Abi-heyvan qiymətin heyvana sorma, Xızra sor,
Çünki idrak eyləməz hər dəgmə heyvan sizlərə.

Hüsn içində Yusifi-Kən'ana təhsin etməzəm,
Onların dövranı keçdi, gəldi dövran sizlərə.

Barmaq ilən göstərərlər kim, üzündür qibləgah,
Ol şəhadətdən dönübdür küfri-iman sizlərə.

Dilbəra, könlündə yoxdur aşiqə qılmaq vəfa,
Xeyri qoymaz miskinə qılmağa şeytan sizlərə.

Çün Süleyman mülkünü qoyduvü getdi dünyadan,
Qaldı andan sonra bu mülki-Süleyman sizlərə.

Eşq içində binəva qaldım, hədər cəhd eylərəm,
Halımı ərz edə bilmən, şahi-xuban, sizlərə.

Əhli-aləm ildə bir qurban edərlər eyd içün,
Hər zaman qurbanınam, ey cümlə qurban sizlərə.

Lütfü ehsan vaxtıdır, şaha, mənə ehsan gərək,
Çün əzəldən qismət olmuş lütfü ehsan sizlərə.

Ey Nəsimi, xubların bir başı vardır, min dili,
Eşqilə bel bağlama bu əhdü peymansızlara.

Çünki rəf' oldu üzündən, ey şəhi-xuban, niqab,
Qalmadı küfrü zəlalət, zahir oldu afitab.

Həq əyan oldu sənə, ey məzhəri-zatü sifat,
Kənzi-məxfi aşikar olduvü həm yövmül-hesab.

Xeymeyi-miad imiş gördüm vücudum sərbəsər,
Kafü nundan iki yana hər tərəf əlli tənab.

Ol ki, bu sirri bilir oldu şəhi-Misri-vücud,
Hökm anın, buyruq anın, ol sahibi-əmrü xitab.

Kirpigin, qaşınla zülfün sirrini məndən eşit,
Ta sənə ərz oluna həm mə'niyi-ümmül-kitab.

Arifi-həq istərəm söz tanıya aləmdə kim,
Söyləyəm məqsudumu ta ol verə gerçək cavab.

Divi-naməhrəm nə bilsin sirri-ərvahi-nəbi,
Talibi-dünyayi-dundur nəfsi-nadanü kilab.

Sirri-pənc əlhəmd faş oldu zi vəchü dəstü pa,
Ey kəlamüllahi-natiq, ta be key başi bexab.

Valiyi-əhd oldun, ey Seyyid, zi Fəzli-ləmyəzəl,
Gör nə der vali budur, vallahu ə'ləm bissəvab.

Şol tamam ayın üzündən çünki rəf oldu niqab,
Zülmətin dövranı keçdi, zahir oldu afitab.

Ləblərin camı meyindən cümlə əşya əsrimiş,
Təyyib, ey pakizə saqi, barəkallah, ey şərab!

Ey yanağın həsrətindən cənnətin qəlbində nar,
Vey dodağın şərbətinlən kövsərin eynində ab!

Ey üzün həmra gülündən lalənin camında mey,
Vey gözün sevdalarından nərgisin gözündə xab.

Həq-təalanın kəlamı surətin təfsiridür,
Ey üzün inna fətəhna, həqdən açıldı bu bab.

Kirpigin, qaşınla zülfün həq kitabıdır, vəli
Ol kitabı kim bilir mən indəhü ümmül-kitab?

Surətin lövhündə yazılmış hürufu bilməyən
Bilmədi sövmü səlatı, sağişi-yövmül-hesab.

Abi-heyvandır dodağın, ruhi-qüdsidir dəmin,
Surətin həqdir, üzün – vəllahu ə'ləm bis-səvab.

Qaziyül-hacat imiş lə'lin məgər kim, aşiqə
Hər nə kim, qıldı təmənna, üstəcib gəldi cavab.

Dilbərin eşqində, ey salik, ikilik pərdədir,
Mənligin rəf' olmayınca aradan getməz hicab.

Ey Nəsimi, səcdə qıl şol maha kim, həqdən sana
Fə'budu əyyahu vəscud vəqtərib gəldi xitab.

Vəchdən dilbər götürmüşdür niqab,
Qəd nəcatəm min şitab illa nəcab.

Qalə təbtəm, sirri çün qaşi, gözü
İz əbəd aydır hürufi-lil-hicab.

Əmr çün gəldi bəşarətlər bizə,
Min həbibi indəhü elmül-kitab.

Latələzmu gəldi əyyami-vüsal,
İz fətəhtüm eyyühəl-üşşaq bab.

İz rəfə-təl hicb, bir baxın bizə,
Fənzəru fil-yovm qeyrən-niqab.

Layənalu bu qapıdan getməniz,
Zinqədər hərrəm əleynəl-ictinab.

Əsməu Seyyid kim, aydır uş sizə;
Və’ləmü vəllahü ə’ləm bissəvab.

Əcəb lə’linmi şol, ya cani-əhbab?
Əcəb zülfünmü, ya zənciri-pürtab?

Gözümdən axan, ey dilbər, qəmindən
Əcəb xunabəmi, ya əşki-innab?

Əcəb qəddinmi şol, ya sərvi-bustan,
Əcəb xəddinmi şol, ya vərdi-sirab?

Əcəb eyninmi şol, ya sehri-Babil,
Əcəb dişinmi şol, ya lö’löi-nab?

Əcəb üzünmü şol, ya xirməni-gül,
Əcəb qaşınmı şol, ya taqi-mehrab?

Əcəb şol məsti-sevdayi-moğolçin,
Mənim bəxtimmidir, ya çeşmi-pürxab?

Nəsiminin gözü yarın qəmindən
Dürün dürcümidir, ya bəhri-simab?

Zülfün girehləri, sənəma, həlqə-həlqə tab,
Hüsnün qatında zərrəcə yox nırxi-afitab.

Dərgahınızda qoyma rəqibi-münafiqi,
Zira ki, Kə'bənin hərəmi istəməz kilab.

Abi-rəvanü səbzəvü məhbubi-məhliqa
Busi-kənarü yari-qəzəlxan ilə kitab.

Xoşdur, əgərçi cümləsi bir yerdə cəm ola,
Avazi-çəngü nəğməvü tənbur ilən rübab.

Saqi, gətir bu məclis içində qədəh yürüt,
Sığmaz hədisü tövbəvü təqva, gətir şərab.

Nari-qəmində bağrımı büryan bişirmişəm,
Bildim yəqin ki, nərgisi-məstin dilər kəbab.

Bülbül kimi Nəsimi dilər ki, fəğan edə,
Gül söhbətinə yaramiyə naleyi-ğürab.

Ey üzün "nəsrün-minəllah", vey saçın "fəthün-qərib",
Ey bəşər surətli rəhman, vey mələksima həbib!

Valehəm hüsnünə, ey mişkin saçından münfəil,
Cənnətin bağında reyhan, sünbülün çiynində tib!

Zülfü rüxsarındır ərrəhman-ələl-ərş-istiva,
Kə'bənin mehrabı qaşın, fitnəli eynin xətib.

Ənbərəfşan sünbülün əsrarı oldu aşikar,
Gəldi ruhüllahü mənsux oldu zünnarü səlib.

Surətin lövhindən endirdi kitabı Cəbrəil,
Ey camalın həq kəlamı, innəhü-şey'ün-əcib.

Aşiqin əsrarını, həqqi bilən arif bilir,
Aşina halın nə bilsin nəfsini bilməz qərib.

Kim ki, sevdasından oldu sayru şəhla gözlərin,
Şərbəti şirin ləbindir, Isəvi nitqin təbib.

Xubların eşqindən, ey zahid, məni mən' eyləmə,
Çün mana eşq eyləmiş qismət günündə həq nəsib.

Ey ədib, uy vermə adabından əhli-vəhdətə,
Əbsəm ol, niçün ki, eşq adabını bilməz ədib.

Cənnəti-ədnin gülüstanı rüxündür, şək deyil,
Ey gülüstanında ruhüllahi-rizvan əndəlib.

Ey Nəsimi, çün rəfiqin Fəzl imiş, yə'ni ilah,
Lütf ilə qəhr oldu vahid, həm həbib oldu rəqib.

Gülşəni-firdövs edər can bağrını vəsli-həbib,
Atəşi-duzəx qılır həm möhnəti-cövri-rəqib.

Dərdimin dərmanına heç kimsə bilməz çün əlac,
Yaridən özgə nə çarə, söyləgil sən, ey təbib.

Çün bəlavü qüssədən xali deyil könlüm, vəli
Mən gədavü kəmtərə artıqdurur hər dəm nəsib.

Rəhm edər şol gözlərin hər qanda bir üftadə var,
Mən fəqirəm, mən həqirəm, cümlədən miskin, qərib.

Gər görər vaiz üzünü, dəmbədəm eylər fəğan,
Oda yaxar mənbərini, görsə ani həm xətib.

Gül üzünə aşiq olub qanda bir üşşaq var,
Xoş nəvayi-saz edər daim nəvayi-əndəlib.

Hacəti vəsl oldu hüsnündən Nəsimi müşküli,
Sübhdəm irdi, gətirdi ol səba xoş buyü tib.

Canana mənim sevdiyimi can bilir ancaq,
Könlüm diləyin dünyada canan bilir ancaq.

Bildim, tanıdım elmdə mə’budu, yəqin ki,
Şöylə bilirəm kim, anı Qur’an bilir ancaq.

Abdal oluban bəylik edən arifi gör kim,
Bu səltənətin qədrini sultan bilir ancaq.

Sufimidir ol cami-müsəffasına məşğul,
Pünhani içər eylə ki, şeytan bilir ancaq.

Ey saqi, gətir dövr əyağını dövr eləsün kim,
Bu dövr əyağın dövrünü dövran bilir ancaq.

Könlüm gəmisin qərq edə gör eşq dənizinə
Kim, bu dənizin bəhrini ümman bilir ancaq.

Heç kimsə Nəsimi sözünü kəşf edə bilməz,
Bu, quş dilidir, bunu Süleyman bilir ancaq.

Yarəb, nə səbəbdəndir olur taqətimiz taq,
Çoxdan bəridir çeşmimiz ol çeşminə müştaq.

Andan bəri kim, eynimiz ol üzünü gördü,
Bir mu ilə asıldı canım, qaldı müəllaq.

Gülzarə qədəm bas sənəmü saz ilə, mütrib,
Gəl eyş edəlim zövq ilə, gər olmasa zərraq.

Pərvanəsifət oldum o rüxsarına qarşı,
Bel bağlamışam xidmətinə mən də çü üşşaq.

Yazım der idim naməyi əz xuni-cigər mən,
Töküldü yürək qanı yerə, tutmadı övraq.

Gördü ki, tükənməz yazuban vəsf ilə şərhin,
Qatlanmadı bu dərdə zəif, oldu qələm şaq.

Ey hüsn iyəsi, aşiqə bir mərhəmət eylə,
Sun lütf ilə biçarəyə bir cami-mürəvvaq.

Gər istər isən yarı bu gün, pir tələb eylə,
Gör kim, neçə yol göstərir ol piri-mühəqqaq.

Allah ilə ol imdi, niyaz eylə, Nəsimi,
Başəd ki, suçundan keçə, lütf eyləyə rəzzaq.

Könlümün şəhrini çün kim, eylədi yəğmayi-eşq,
Saldı aləm mülkünə şuri-şərü qovğayi-eşq.

Çıxdı sərvim, aləmə əsrarımı faş eylədi,
Halıma həmdəm olandan dünyada sevdayi-eşq.

Qalmadı namusü namım eşq içində zərrəcə,
Qoymuşam namusü namı, olmuşam şeydayi-eşq.

Nitq imiş aləmdə mövcud, eşq imiş qayimməqam,
Bizə bildirdi əzəldən rəhbəri-mövlayi-eşq.

Sən humayun laməkansan, kəndözündən bixəbər,
Gəlmədin ta kim, görəsən mənzili-ə'layi-eşq.

Çıx qəfəsdən, gəlgil, ey bülbül, gülüstan seyrin et,
Bas qədəm meydani-eşqə görəsən mə'vayi-eşq.

Eşq ilə hər dəm, Nəsimi, seyr edərsən Kuhi-Qaf,
Sənsən ol ali məqamda şəhpəri-ənqayi-eşq.

Nagəhan könlümə düşdü şurişi-qovğayi-eşq,
Aqili divanə qıldı aqibət sevdayi-eşq.

Eşqə düşənlər bilir həm yenə eşqin qədrini,
Ol aşiq aşiqmidir kim, olmadı rüsvayi-eşq.

Eşq içində dinü dildən gəl keç imdi, ey fəqih,
Şeyxi Sən’an kimi ol gəl sən dəxi tərsayi-eşq.

Kim ki, istər dilbərinin xəlvətinə yol bula,
Can fəda qılmaq gərəkdir min kərə dər payi-eşq.

Sevgilimin sevgisindən özgə sığmaz könlümə,
Sevgilimdən özgəyə qılmaz bu gün pərvayi-eşq.

Könlümün viranəsin mə’mur qıldı eşqi-yar,
Canımın xəlvətsərasın qılmışam mə’vayi-eşq.

Aşiqi-canan olubsan, ey Nəsimi, sən bu gün
Könlünü aldurdun, oldun axərin yəğmayi-eşq.

Bu nə adətdir, ey türki-pərizad,
Qəmindən olmadım bir ləhzə azad.

Siyəhdil gözlərin qan tökmək içün
Çəkibdir tiğini manəndi-cəllad.

Bu bidadı mana eşqin qılıbdır,
Cahanda qılmadı Nəmrudü Şəddad.

Rəvamı, könlümün şəhrində səndən
Fəraqü qüssəvü qəm tutdu bünyad.

Gəl, ey Şirindəhən, eşqin yolunda
Mənəm ol kuhkən biçarə Fərhad.

Nəzər qılgil bu viran könlümə, şah,
Qılır sultan olan viranı abad.

Bir eyü ad edin fani cahanda,
Ululardan cahanda qaldı bir ad.

Nəsiminin kəlamından eşitgil,
Vəfasızdır cahan, sən qılma bidad.

Bənövşə zülfünü salmış gül üzrə ənbərin sayə,
Könül heyranü zar oldu bu reyhani-səmənsayə.

Lətafətdən edər əksi ləbin lə’li-bədəxşanə,
Zərafətdən urar tə’nə dişin lö’löi-lalayə.

Pərişanhal olmuşdur könül zülfün səvadından,
Bu divanə nədən düşmüş bu piça-piç sevdayə.

Əzəl nəqqaşı yazarkən cəmalın nəqşini, dammış
Qələmdən nöqteyi-ənbər bu gülbərgi-dilarayə.

Nə gül bitdi gülüstanda ki, bənzər uşbu rüxsarə,
Nə bir sərv ola bostanda ki, həmta qəddi-balayə.

Xəti reyhandürür gör kim, göyərmiş kövsər üstünə,
Və ya rüxündən ayətdir oxunmuş bədr ilə ayə.

Nə şirin şərhini eylər Nəsimi ləblərin, yarəb
Ki, məst olur həlavətdən bu tutiyi-şəkərxayə.

Düşürmüş ənbərin zülyfün hümayun kölgəsin ayə,
Təaləllah, zəhi sünbül, təaləllah, zəhi sayə!

Nəzirin yazamaz ayruğ əzəl nəqqaşı rüxsarın
Ki, hüsnün dövri xətm oldu bu rüxsari-dilarayə.

Qaşın me'racinə sufi irişmək istər, ey huri,
Vəli hər qasir idrakın ürucu irməz ol yayə.

Üzün vəş-şəmsü yasindir, müsənna kirpiğin taha,
Tanıqdür əlləzi-əsra bu me'racü bu əsrayə.

Rüxün əsmayi-hüsnadır, təala şanəhu, gör kim,
Nə ehsan eyləmiş möhsin bu hüsni-surət-əsmayə.

Saçındır leylətül-əsra, qaşın əsrari-ma əvha,
Qanı həqdən irişmiş can bu ma əvhayü əvhayə.

Vüsalın qiyməti dürdür, nəhayətsiz dəniz eşqin,
Bu dürrün kanın ol buldu ki, qərq oldu bu dəryayə.

Rüxün rəngi, saçın buyi nə ziba rəngü budur kim,
Gülü gülzarə göndərdi, buraxdı mişki səhrayə.

Gəl ey tuba, sücud eylə bu siminbər səhi sərvə
Ki, əmri-əscədü gəldi bu rə'na qəddü balayə.

Pərişan zülfünün halın nedirsən bilmək, ey aqil?
Bu sevda incə sevdadır, dolaşma sən bu sevdayə.

Saçın vəslindən ol aşiq həyati-cavidan buldu
Ki, təslim eylədi canın bu reyhani-səmənsayə.

Münəvvər əbhərin türkü evin yəğmaladı əqlin,
Moğol hər qanda varırsa düşər taracü yəğmayə.

Nəhəngi-məcməül-bəhreyn xüruç etdi məkanından,
Sədəf ağzındakı dürrü buraxlı qə'ri-dəryayə.

Bu gün şol mahi-tabanın üzün gör zahir, ey abid
Ki, məhrum oldu ol xasir ki, məğrur oldu fərdayə.

Nəsimi çün səni buldu, dü aləmdən vəhid oldu,
Kəsildi mavü mənlikdən, ulaşdı zati-yektayə.

Bu necə qəddü qamətdir ki, bənzər sərvi-balayə,
Bu necə hüsnü surətdir ki, nur ehsan edər ayə.

Cəmalından münəvvər ay ilə xurşid, ey dilbər,
Mələkdir valehü heyran bu gün bu hüsni-zibayə.

Qaşındır qab ilə qövseyn ki, əsrarına əql irməz,
Vəli bu sirri ol bildi ki, qurban oldu ol yayə.

Ləbin şol lə'li-əhmərdir, dişin ol dürri-gövhərdir
Ki, lə'li torpağa saldı, buraxdı dürrü dəryayə.

Rüxün kimi müzəyyəndir gülü lalə, anın şövqi,
Yanağın əksi düşmüşdür məgər kim, vərdi-həmrayə.

Cahanın torpağı çünki, əbirə ənbər olmuşdur,
Səba mişkin saçın buyi buraxdı müşkü səhrayə.

Vüsalın istəyən aşiq əcəb sevdayə düşmüşdür,
Cahanü canı tərk eylər, düşər hər kim bu sevdayə.

Bu gün, ey xubların şahı, əmiri-dilbəransan kim,
Xəyalın ləşkəri verdi könül şəhrini yəğmayə.

Gözümdən gərçi pünhandır nigarın surəti, amma
Görünən vəchidir anın nəzər qıldıqca hər cayə.

Ölürsə iştiyaqından, nə qəm, hicran ilə Seyyid,
Üzünü gördü vü irdi bu gün firdövsi-ə'layə.

Surəti-həqqə, ey sənəm, bədri-rüxündür ayinə,
Daş ola kim ki, surətin olmaya aşiq ayinə.

Eşqi-rüxün təriqidir dari-səlamətin yolu,
Mənzilinə qaçan irür kim ki, bu yolda tayinə.

Dünyəvü mülkü malinə meylü məhəbbət eyləmə,
Çün gedisərsən, ey məlik, axirətin sarayinə.

Vəsli-rüxündən, ey pəri, ta əbəd oldu möhtəcib
Kim ki, müqəyyəd olmadı zülfü girehgüşayinə.

Fatihədir anın üzü, nunü əlifdir ayəti,
Səllü və səlləmü əla surəti-canfəzayinə!

Zülfi-dütasının qəmin sor bu əsiri-eşqə kim,
K’oldur əsir edən məni silsileyi-dütayinə.

Başinə kim ki, düşmədi kölgəsi ənbərin saçın,
Dövlətə sadiq olmadı, uğramadı hümayinə.

Hur ilə cənnətü liqa görməyə həqdən, oyla bil,
Kim ki, üzündə görmədi həqqi bu gün müayinə.

Eşqinə kim ki, qılmadı baş ilə canını səbil,
Dərdinə çarə bulmadı, uğramadı dəvayinə.

Vermişəm ol qara saçın qövlü qərarına könül,
Gərçi inanmazam anın əhdinəvü vəfayinə.

Hüsnü rüxün zəkatını ayə gər eyləsən əta,
Mehri-müniri-təl’ətin görünə, mah bayinə.

Hüsnünə xaliqülbəşər xətmi-məlahət eylədi,
Dövlət anın kim uğradı xətməsinin duayinə.

Canverici ləbindədir şərbəti xəstə könlümün,
Kimdir irişdirən anı şərbətinin şəfayinə?

Lə'li-ləbin hədisini incuyə nisbət eyləyən,
Gör nə cəfalər eyləmiş cövhəri-canfəzayinə.

Eşqinə verməsin könül şol sənəmin, Nəsimitək
Kim ki, təhəmmül eyləməz cövrünəvü cəfayinə.

Hər kim ki, müştaq olmadı şol dilbərin didarinə,
Yetişmədi Musa kimi anəstünarın narinə.

Yarın liqasın istəgil, canını vergil vəslinə
Kim, şol nigara, çox degil, sən qalma dünya varinə.

Qalü bəladə yar ilə qövlü çü qıldın, ey könül,
Qövlündə sadiqdir ki, mən inanmışam iqrarinə.

Yarəb, nə şəm'in nuridir gülgün yanağın, ey qəmər,
Kim, noh fələk pərvanədir şol surətin ənvarinə.

Çün dünya cifədir dedi həqqin rəsulu, talibi,
Çün kəlb imiş, gəl fariğ ol, baxma anın murdarinə.

Ol dilbərin yolunda tərk etdi Nəsimi canını,
Bil çox deyil canü cahan gər tərk edərsə yarinə.

Canda ki, eşq olmadı, dildə xəbər nə faidə?
Gözdə ki, görmək olmadı, nuri-bəsər, nə faidə?

Hər kişi kim, əzəldə ol binəsib oldu mə'nidən,
Ayətü təfsirü kəlam, ana xəbər nə faidə?

Gövhərin üştə qiymətin sərraf olan arif bilir,
Ol ki, mübəssir olmadı görə göhər nə faidə?

Tutidürür bu şəkkərin dadını, ləzzətin bilən,
Qarğa nedər bu gülşəni, zağə şəkər nə faidə?

Dərd ilə sən Nəsiminin gövhərini gəl almağıl,
Aşiq olan kişilərə eşqə süpər nə faidə?

Ay ilə gün sücud edər surəti-canfəzayinə,
Ay ilə gün nədir kim, ol düşməyə xaki-payinə.

Cami-cahannümadur ol, səndə iki cahanı gör,
Çün görəsən sən olmusan cani-cahanə ayinə.

Faili-mütləqi-yəqin kim ki, dilər görə bu gün,
Baxsın anın camalına, həqqi görər bu ayinə.

Aşiqi-sadiq oldurur həq yoluna şəhid ola,
Həq deyəni alır anun durmuş anun bəhayinə.

Yusifi-Misri canü dil, yə'ni ki, Fəzli-zülcəlal,
Gəldi səfavü zövq ilə şəhri-bədən sərayinə.

Qıldı fəna vücudumu küll kərim ilə kəlam,
Zərqi-həsən budur ki, şah sandı bu gün gədayinə.

Hər ki, Nəsimitək sücud Fəzli-ilahə qılmadı,
Div kimi bu gün anı bəlkə bu yolda dayinə.

Dünya duracaq yer deyil, ey can, səfər eylə!
Aldanma anın alına, andan həzər eylə!

Bir halə qərar eyləməz əyyam, keçər ömr,
Ey əhli-nəzər, baxma bu halə, nəzər eylə!

Payəndə degil dövləti, ey xacə, cahanın,
Əsbabinə aldanma, gəl andan güzər eylə!

Gər aşiq isən sidq ilə şol dilbər üçün, gəl
Can ilə cahan ortaya qoy, tərki-sər eylə!

Düşdü saçının zülmətinə könlüm, ilahi,
Şol hali pərişanə bu şami səhər eylə!

Çün hüsnünə xətm oldu bu gün dövri-məlahət,
Ey fitnələrin xatəmi, şəqqül-qəmər eylə!

Gər Musiyi-Imran kimi şol narə sataşdı,
Gəl, tabişini göstərü şərhi-şəcər eylə!

Dünya evinin səltənəti beş gün imiş çün,
Bünyadını yıx, ər kimi, zirü zəbər eylə!

Şol püstədəhanın xəbərin bildi Nəsimi,
Şirinlərə şol tüngi-şəkərdən xəbər eylə!

Düşdü yenə dəli könül gözlərinin xəyalinə,
Kim nə bilir bu könlümün fikri nədir, xəyali nə?

Al ilə ala gözlərin aldadı aldı könlümü,
Alını gör nə al edər, kimsə irişməz alinə.

Qiymətini dodağının dəgmə xəsisə sorma kim,
Mən bilirəm ki, can ilə susamışam zülalinə.

Gözlərinə əsir olan halımı, oldur anlayan,
Kim ki, bu halə düşmədi qoy vara kəndü halinə.

Sirrini şol qara bənin çünki yanağı şərh edər,
Can, nə ola nisar edəm yanağınavü xalinə?

Dadlı sözündən utanır abi-həyat, məhv olur,
Gülbəşəkər nə nəsnədir kim, irişə məqalinə?

Hüsnü cəmalü surətin məclisi bərkəmaldır,
Şərhü bəyanü vəsfinə əql irəməz kəmalinə.

Üzünü, qaşını görən qarşubəqarşu, gözbəgöz,
Sanma ki, baxa ol gögün bədrinə ya hilalinə.

Aşiqi-sadiqin qanı yarə həlal imiş, vəli,
Girsə əgər rəva degil dilbər anın vəbalinə.

Ay ilə gün sücud edər surətini göricəgiz,
Bu nə cəmalü hüsn olur, səlli-əla cəmalinə.

Buldu Nəsimi çün səni, keçdi qamudan, ey sənəm,
Qoydu hərirü ətləsi, girdi əbavü şalinə.

Bahar oldu, gəl ey dilbər, tamaşa qıl bu gülzarə,
Buraxdı qönçələr pərdə bəşarət bülbüli-zarə.

Şəqayiq pərdədən çıxdı, boyandı bağ ilə bostan,
İrişdi gülşənin hüsnü boyandı rəngi əzharə.

Məni mən’ etmə, ey zahid, güvənmə zikrə, ey sufi
Ki, sən məğrurisən zikrə, mənəm müştaq didarə.

Ki, hər bəlhüm əzəl bilməz nədir kim, eşqin əhvalı,
İrişməz qasirin əqli bu müğləq sirri-əsrarə.

Əbirü mişkü ənbərtək rəyahindən çəmən doldu,
Səhərdə tə’n edər saçın nəsimi mişki-tatarə.

Ki, çıxdı qönçədən sünbül giriban çak edər məntək,
Dəlindi qüssədən bağrım, sən etmə yürəgim yarə.

Çəmənlər müxtəlif oldu həzar əlvan çiçəklərdən,
Açıldı laləvü nəsrin, şükufə gəldi əşcarə.

Açıldı nərgisü lalə, tutubdur yasəmən çadır,
Söyütlər, ərğəvan titrər, qamışlar mindi ənharə.

Bənövşə, gül tamaşası qənimət bil ki, beş gündür,
Satar mə’şuqə gül hüsnün, xəridar ol bu bazarə.

Yaxıldı canına canı dəmi-İsa Nəsiminin
Vüsali dərdinə dərman, irişdi cani-bimarə.

Həbiba, firqətin saldı məlalə,
Kabab oldu ürəgim həmçü lalə.

Nəsib olmuş mənə həqdən, nigara,
Dilimdə gecə-gündüz ahü nalə.

Qaşın mehrabinə qıldım sücudi,
Vəli münkir olan düşdü zəlalə.

Rəqibin olmasın məqsudu hasil,
Əliftək qəddimi ol saldı dalə.

Boyun tuba, ləbindir abi-kövsər,
Yüzün tə'nə qılır şəmsü hilalə.

Mən ol qəvvas təki can tərkin etdim,
Sənin çöhrəndəki ol xəttü xalə.

Yer ilə göy bina olmazdan əqdəm
Nəsimi aşiq idi ol cəmalə.

Bir saqiyi-baqi ki, vəfa qıldı vüsalə,
Lütf ilə nəzər qıldı mana, sundu piyalə.

İçdim qədəhi-pürmeyi mə'şuqə əlindən,
Cismim qamu can olduvü can uğradı halə.

Can məsti-ələst olduvü la-yə'qəlü heyran,
Könlüm qədəhi dürdü içib irdi zülalə.

Hər bir səri-mu Mənsur olub söylər ənəlhəq,
Həqqa mey içənlər irişərlər bu xəyalə.

Hər kimi ki, yaxmadıvü yandırmadı firqət,
İrmədi Xəlil kimi bu gün nuri-vüsalə.

Yandırdı, bəli, eşqin odu, qıldı məni kül,
Eşqində kül olan irişər külli-kəmalə.

Dəxi nedərəm dünya mənə ərzani qılsa,
Səni dilərəm, qılma məni qeyrə həvalə.

Seyyid, qədəh iç, əbsəm, əzəldən şəhi-təqdir
Hər kimsəyə öz qədri ilə sundu nəvalə.

Yandırıcı firqətin yaxdı məni narinə,
Könlüm ulaşmaq dilər yari-vəfadarinə.

Eşqə əsir eylədi canımı şol cövri çox,
Lütf ilə bir baxmadı yari-giriftarinə.

Oldu gözümdən iraq şol sənəmin surəti,
Yarəb, irişdir məni dövləti-didarinə.

Gərçi süzülmüş gözü eylədi sayru məni,
Rəhməti anın qanı aşiqi-bimarinə?

Yürəgimi yarəli eylədi şövqün, iriş,
Yarəsinə bax bu gün, qoyma anı yarinə.

Yandırıram canımı şəm’inə pərvanətək,
Yanar imiş yar üçün vasil olan yarinə.

Mülk ilə mal, ey məlik, kimsəyə çün qalmadı,
Yox tut anı, heçə say, qalma onun varinə.

Eşqinə qalu bəla çün demişəm sidq ilə,
Əhdini sındırmazam, durmuşam iqrarinə.

Yarə Nəsimi kimi canını qurban edən,
Məhrəm olur ta əbəd məxzəni-əsrarinə.

Gəlgil ki, müştaq olmuşam şirin ləbin gül qəndinə,
Gəlgil ləbin qəndin ilət, gül anların gülqəndinə.

Hər qanda kim, şərh eyləsəm şirin dodağın qəndini,
Ərvah üşər sinək kimi ol dadlı şəkkərxəndinə.

Şəhla gözün məndən könül aldıvü and içər ki, bu
Kəffarət olsun canü dil ol gerçəgin sövgəndinə.

Mişkin saçın məndən məni kəsdivü peyvənd eylədi,
Təhsin anın təqtiinə, rəhmət anın peyvəndinə.

Zülf ilə qaşı qarədir, sərvi-xüraman dilbərin,
Qaşlarına qurban olam, ya türreyi-dilbəndinə?

Ey vaiz, əbsəm ol, mana tamatını ərz eyləmə,
Mən aşiq oldum, girməzəm hər qissəxanın pəndinə.

Ey eşqə inkar eyləyən, çunü çəravü çəndi qoy,
Niçin düşərsən aşiqin çunü çəravü çəndinə?

Zülfü kəməndindən könül qurtulmaz ayruq şoylə bil,
Sevdasinə bel bağlamış, həm göz qaratmış bəndinə.

Çün şəhriyarın şəhrinə bu gün Nəsimidir məlik,
Buyruq anındır, hökm anın həm şəhrinə, həm kəndinə.

Dərdə müştaq olmayan kimdir ki, dərman istəyə?
Qəbləl-mövti bilməyən, sən sanma ki, can istəyə.

Cövhəri olmaq gərəkdir, cövhəri bulmaq gərək,
Hər kimin könlündə vardır, vara ol kan istəyə.

Can ilə, dünyavü üqba hər kim ol tərk etmədi,
Müddəidir, sanma kim, ol vara canan istəyə.

Xizrlə zülmatını tanımayan heyvan kimi,
Nə bilə kim, qanda vara, abi-heyvan istəyə?

Kim əzəl tanımadı kəndi vücudu şəhrini,
Ol gədahimmət nə yoldan vara sultan istəyə?

Ənbərin zülfü anın, kim ki, dolaşdı boynuna,
Başı top olsun anın, gər özgə çövkan istəyə.

Zülfünün küfrün əgərçi əhli-fəzl iman bilir,
Ey Nəsimi, sanma sən kim, kafər iman istəyə.

Sünbüli-zülfünün əgər qonşusu lalə düşməyə,
Almaya kimsə könlünü, şiveyi-alə düşməyə.

Surəti-həqsən, ey qəmər, pərdəsiz eylə üzünü,
Ta büti-azəri yazan nəqşi-xəyalə düşməyə.

Sovməə əhlini üzün də'vət edərsə gər meyə,
Zahid əlindən ayruq ol cami-piyalə düşməyə.

Yüz ilə qaşını necə vəsf edə ya bəyan qıla,
Şol ki, anın nigahı ol bədrü hilalə düşməyə.

Xalü xətin qələm kimi şərh edərəm ki, bir dəxi
Sərzəniş eyləyən məni cürmü vəbalə düşməyə.

Sünbülünü gül üstünə qoyma ki, yeli dağıda,
Ta ki, xəyali-xam edən fikri-məhalə düşməyə.

Xal ilə ənbərin saçın dal ilə nüqtədir, vəli,
Kim deyə zal, əgər bənin nüqtəsi dalə düşməyə.

Fitnə qara gözün məni-məsti məlalət eylədi,
Şol qədəhi kim içə kim, varə bu halə düşməyə?

Pərdədə yaşır, ey qəmər, üzünü ta ki, münkirin
Kəmnəzəri bunun kimi hüsnü cəmalə düşməyə.

Qüdrət əli əgər üzün nəqşini yazə günəşə,
Ta əbəd ol kəmal ilə qalə, zəvalə düşməyə.

Söylənə gər Nəsiminin mədrəsədə məqaləti,
Dərsini qoya mədrəsə, qiyl ilə qalə düşməyə?

Afərin olsun nigarın zülfü ilə qaşinə,
Gər macal bulsam həbibin çövriləydim başinə.

Mənzilə irmək dilərsən, eşqi yoldaş eyləgil,
İrmədi mənzilinə, kim baxmadı yoldaşinə.

Kə’bənin ehramına irməz hacının dəgməsi,
Çizginir dər girdinə, sürtər üzünü daşinə.

Şol rəqibi görə idim çah içində bir kərə,
Gilliyəydim başına şol səd həzaran daş yenə.

Ey rəqib, bir yerdə ölgil ki, bulunmaz aşü su,
Qarğavü quzğun yığılsın leşinə, hey leşinə.

Buduna çıxsın ufalar, gözünə həm qara su,
Tutulsun dilü qulağın, bir neçə daş dişinə.

Dedilər, miskin Nəsimi, doğruya yoxdur zaval,
Müddəilər qalib oldu, hazır olgil başinə.

Düşdü könül ala gözün ağınavü qərasinə,
Ayrıq anınla kimsənin ağı nədir, qərasi nə?

Gəldi fəğanə can yenə ney kimi, suzü dərd ilə,
Kim nə bilir bu xəstənin dərdi nədir, dəvasi nə?

Türrəsinin cəfalərin sorsa bu mübtəlayə kim,
Eyləmişəm fəda anın canımı hər bəlasinə.

Çünki cəfasız, ey könül, kimsə murada irmədi,
Cövrə təhəmmül eylə, dur şol sənəmin cəfasinə.

Nurü səfa içindəyəm qərğə, vəli, bu haləti
Ol nə bilir ki, düşmədi mehri-rüxün həvasinə.

Yekcəhət olğıl, ey könül, canü cəhanə ur qəfa,
Yüzünü doğru dut həqə, ur qamunun qəfasinə.

Hüsnü cəmalə baxmağa ari səfa nəzər gərək,
Düşməsin arisiz nəzər ayinənin səfasinə.

Dilbər əlində aşiqin qətli nədən həram ola,
Aşiqə çün həlal edər vəslini qan bəhasinə?

Çün bu yalançı dünyanın aqibəti fəna imiş,
Keç qamudan Nəsimitək, baxma anın bəqasinə.

Susadı könlüm nigarın lə’li-ruhəfzasinə,
Talibi-şövqəm həbibin surəti-zibasinə.

Ey səba, uğraşdığınca şol xuraman sərvə tuş,
Məndən öp anın ayağın, səcdə qıl balasinə!

Gözləri sevdası aşiq canına qıldıqların
Ol bilir kim, aşiq olmuş nərgisi-şəhlasinə.

Eynini aç, eynimə bax, cümlə eynin eyniyəm,
Səd həzaran can fədadır eyninin sevdasinə.

Sorma sevdayilərin halin, təbibi-amə kim,
Düşməyən bilməz bu halə, gözləri sevdasinə.

Surəti, hüsnü cəmalı cümlə zibadır anın,
Hüsnünə qurban olayım, bəlkə sər ta pasinə.

Kim ki, zahir görmədi üzündə həqqin surətin,
Güzgüzü ari degildir, çarə qılsın pasinə.

Bibədəldir hüsn içində, lütf içində binəzir,
Vahidiyyət sabit oldu hüsni-bihəmtasinə.

Xırmanında hüsnünün gündür başaqçı ay ilə,
Utan, ey nisbət qılan, qaşi-hilalı dasinə.

Zahidin heç oldu zöhdü, heçə keçdi taəti,
Başladı yasinə, şimdi kimsə gəlməz yasinə.

Çərxi-nərradin nüquşin tərs oxur gözsüz fəqih,
Kə’bəteyni gör ki, atar hoqqabazın tasinə.

Ruhi-qüds oldu Nəsimi, cismini tərh eylədi,
Gövhəri-fərd oldu düşdü vəhdətin dəryasinə.

Mövsimi-novruzü neyistan aşikar oldu yenə,
Şəhrimiz şeyxi bu gün xoş badəxar oldu yenə.

Qönçədən gül baş çıxardı, saldı üzündən niqab,
Bülbüli-şeyda xətibi-laləzar oldu yenə.

Köhnə dünya yengi xəl’ət geydi bu mövsümdə uş,
Çöhrəsi dövri bu gün nəqşü nigar oldu yenə.

Nərgisi gör, cam əlində mey sunar ariflərə,
Cümləsin məst eylədi, kəndi xumar oldu yenə.

Badə içmək rövzədə gər sən dilərsən hur ilə,
Yar əlin tut, bağçaya gir, növbahar oldu yenə.

Saqiya,camı gətir kim, mən uşatdım tövbəmi,
Köhnə təqvimim mənim bie’tibar oldu yenə.

Sən Nəsimi razını, ey dan yeli, yarə yetir:
Sənsizin halım pərişan, biqərar oldu yenə.

Canımı qıldım fəda şol dilbərin didarına,
Aşiq oldur canını qıldı fəda dildarına.

Çünki Məcnun gördü ol üzündə həqqin surətin,
Aşiqin mə'şuqəsi Leyli olur didarına.

Gəl asıl bərdar çün Mənsurləyin, Mənsurvar,
Aqibət mənsurini Mənsur asar darına.

Dünyanın nazü nəimi laşeyi-murdar imiş,
Assığı yoxmuş anın, sən girməgil bazarına.

Şəm'i-ənvari-təcəllidir camalı dilbərin,
Ey könül, pərvanətək gəl yan bu şəm'in narına.

Xoş keçir ömrün, Nəsimi, sən cahanda yar ilən,
Aqil isən təkyə qılma dünyanın dinarına.

Rəhməti gəldi irişdi fəzli-rəhmanın yenə,
Çiçəgi açıldı, güldü şol gülüstanın yenə.

Gül götürdü pərdə üzündən, açıldı növbahar,
Rövnəqi gəldi, dirildi bağü bostanın yenə.

Könlümün əhvalını, gəldi, gözümdən sordu yar,
Övni irdi dərdə yanan canə dərmanın yenə.

Gəldi ruhəfza ləbindən susamış canə səlam,
Xızra ən'amı irişdi abi-heyvanın yenə.

Firqətin dövranı keçdi, gəldi əyyami-vüsal,
Müddəti-dövrü tükəndi acı hicranın yenə.

Zülmətindən leylətül-hicrin mana ayruq nə qəm!
Nuri çün düşdü mana şol mahi-tabanın yenə.

Dilbərin buyi-vəfası zülfünün çinindədir,
Ənbəri yayıldı şol zülfi-pərişanın yenə.

Başıma qutlu ayağın gəldi basdı ol nigar,
Kölgəsi düşdü mana sərvi-xüramanın yenə.

Əhdü peymanından, ey yar, istədi can əl yumaq,
Qoymadı mehrin vəfası, əhdü peymanın yenə.

Ey qəmər, eynin bəla yetməzmidi aləmdə kim,
Fitnə oldu xəlqə zülfi-ənbərəfşanın yenə.

Çün Nəsiminin susamış qanına yarın ləbi,
Noldu, ey münkir, sana kim, qaynadı qanın yenə.

Ey nazı çox dilbər, məni yandırma hicrin narinə,
Çün yanaram pərvanətək şəm’-rüxün ənvarinə.

Hicrin şərabı acıdır, müştaqə içirmə anı,
Neçin ki, yar ol ağuyu içirməz, ey can, yarinə.

Hüsnündən, ey şəmsü qəmər, afaqə düşdü fitnələr,
Kimdir yetən əndişəsiz zülfü rüxün əsrarinə.

Dünyavü üqbadə mənə məqsud sənsən, yoxsa mən
Üqbayə sənsiz baxmazam, həm dünyanın miqdarinə.

Vəslindən oldum çün qəni, mən mülkü malı neylərəm,
Mən künfəkani vermişəm vəsli-rüxün didarinə.

Saçır xəyalın nəqşinə lö’löi -şəhvarı gözüm,
Ey dişləri dür, bax anın dürdaneyi-şəhvarinə.

Üzün ənəlhəqqi məni zülfündə bərdar eylədi,
Mənsur olandır asılan aləmdə eşqin darinə.

Təsbih ilə səccadə çün zərq əhlinin ərkanidir,
Aşiqlərə zülfün yetər də’vət qıla zünnarinə.

Gər vasil olmaq yar ilə istərsən, ey aşiq, bu gün
Gəl ur Nəsimi tək qafa kövnü məkanın varinə.

Bərgi-nəsrin üzrə mişkin zülfünü dam eyləmə,
Aşiqi-aşüftəyi bisəbrü aram eyləmə!

Şol moğolçin nərgisinlə çünki qapdın könlümü,
Bağrımı cövrinlə pürxun, ey dilaram, eyləmə!

Kimsə çün yarın vüsalın bulmadı tamat ilə,
Əbsəm, ey xəlvətnişin, əndişeyi-xam eyləmə!

Və'də qılmış həq bizə çün səlsəbilü hurü eyn,
Qoyma əldən şahidi, tərki-meyü cam eyləmə!

Aşiqi-sadiq duzağın quşu, ey zahid, degil,
Danə düzmə təsbihi, səccadəyi dam eyləmə!

Zülfü rüxsaridir anın zikrimiz hər sübhü şam,
Zikrsiz hərgiz, ilahi, sübhümüz şam eyləmə!

Çün Nəsiminin muradı sənsən, ey arami-can,
Xəlq içində anı düşmənkamü bədnam eyləmə!

Getməgə əzm eyləmişsən, ey dilaram, eyləmə!
Həsbətənlillah, məni bisəbrü aram eyləmə!

Daneyi-mişkin xalın könlümü çün seyd eylədi,
Bu tutulmuş seydə, şahim, zülfünü dam eyləmə!

Sünbülü bərgi-gül üzrə, ey pəri, dağıtma kim,
Bunca könlü yanmışın sevdasını xam eyləmə!

Ömrümün sübhü üzündür, bəxtimin şamı saçın,
Getmə, ey dilbər, gözümdən, sübhümü şam eyləmə!

Rindü qəllaşəm, mənə zahid demə, ey müttəqi,
Laübali aşiqi aləmdə bədnam eyləmə!

Eşqini tərk etmək istər könlüm, amma çin degil,
Ya ilahi, kimsəyi sən bisərəncam eyləmə!

Çeşmeyi-lə'lin suyundan bir qədəh sun, saqiya,
İştiyaqından Nəsimi gözlərin cam eyləmə!

Salıbdır daneyi-xalın könüllər quşuna çinə,
Xəbər düşdü bu mə’nidən Xətavü Rum ilə Çinə.

Könül laçın deyü düşdü ki, ala şol göyərçini,
Göyərçin bayquşa düşdü, yazıqdır imdi laçinə.

Cahanda kimsə görməmiş ki, bayquş ala göyərçin,
Qəzayi-asimanidir, bəla gəldi göyərçinə.

Gülü gülzari-pürçindir, qonubdur zülfi-pürçinə,
Nə güldür bilməzəm, yarəb, ki pürçin qondu pürçinə.

Xilafi-və ’də gər qılsa Nəsimi, qəm deyil, şayəd
Tərəhhüm eyləyə bir gəz, yalanı dəgşirə çinə.

Şənbə günü mən uğradım ol sərvi-rəvanə,
Şeyda qılıban saldı məni cümlə cəhanə.

Yekşənbə günü məcnun olub heyranı oldum,
Gördüm üzün, oxşatdım anı mahi-təbanə.

Düşənbə günü razi-dilimi dedim axır,
Ol gözləri nərgis, üzü gül, qaşı kəmanə.

Səşənbə günü səyyad olub seyrana çıxdım,
Mən seyd oluban qurban olum püstə dəhanə.

Çərşənbə günü yar gəzə gəldi çəmən içrə,
Bülbül dəxi gördü üzünü, düşdü fəğanə.

Pəncşənbə günü yarə dedim: pəndim eşitgil,
Faş etmə bu razi-dilimi yaxşı-yəmanə.

Adinə günü gördü camalını Nəsimi,
Əmdi ləbi-lə’li-şəkkərin ol qanə-qanə.

Düşmüş müənbər sünbülün xurşidi-taban üstünə,
Şol rəsm ilə mişkin bənin gülbərgi-xəndan üstünə.

Könlümü viran eylədim, mehrin yerin can eylədim,
Eşqin mana şan eylədim, düşdü qəmin can üstünə.

Dərdi-məhəbbət aşiqə dərman yetər, var, ey həkim,
Hərdəm mana bir dərd ilən artırma dərman üstünə.

Rüxsarın üzrə zülfünü hər kimsə kim, gördü dedi:
Küfri-siyəhdir, sanasan, dağıtmış iman üstünə.

Yaquti-reyhandır xətin, ey quti-can, lə’li-ləbin
Şö’lə ki, düşmüş Xızr tək ol abi-heyvan üstünə.

Nuri-təcəlli sirrini xalında gördü gözlərim,
Gör kim, nə surət bağlamış bu çeşmi-giryan üstünə.

Eşqindən, ey arami-can, gərçi Nəsimi xak olur,
Durmuş səninlə ta əbəd şol əhdü peyman üstünə.

Fəraqı çəkməyən aşiq vüsalın qədrini bilməz,
Cəmilə olmayan vasil cəmalın qədrini bilməz.

Şəbi-əsradə qövseynin iki nisf eylədi ayı,
Bu mö'cüzdən olan qafil hilalın qədrini bilməz.

Xəyalından gözün hər kim, buraxdı özgə mənzurə,
Bu mə'nidəndir, ey can kim, xəyalın qədrini bilməz.

Dodağın səlsəbilindən xəbərdar olmayan qafil,
Anın mahiyyəti oddur, zülalın qədrini bilməz.

Müdəvvər nöqteyi-xalın bəbəktək eynə qondurdum,
Bəbəksiz qalsın ol göz kim, bu xalın qədrini bilməz.

Kəlamüllahə, ey dilbər, ki boyun gərçi dal oldu,
Hər əyri baxanın eyni bu dalın qədrini bilməz.

Üzündür şəksiz allahın yəmini, Kə'bəsi, beyti,
Yəmini bilməyən, bil kim, şimalın qədrini bilməz.

Nihalın e'tidalından utanır sidrəvü tuba,
Bu qəddi bənzədən sərvə nihalın qədrini bilməz.
Günəş mahın təmamindən zəvalə hər gün uğrar, çün
Nədən şol afitabi-bizəvalın qədrini bilməz.

Nəsimi sufə dəgşirməz qəmindən geydigi şalı
Kim, ol sufi səfasızdır, bu şalın qədrini bilməz.

Dilbəra, dil səndən özgə bir dəxi yar istəməz,
Çün müyəssər oldu vəslin, qeyri didar istəməz.

Könlümə eşqini qismət çün əzəldən qıldı həq,
Ta əbəd eşqindən özgə nəsnə, zinhar, istəməz.

Könlümün Mənsuri çünkim, zülfünü edindi dar,
Yə'ni ki, Mənsur olan zülfündə bərdar istəməz.

Mən kəsildim masivallahdan bu gün, ey müddəi,
Vahid oldum yar ilən, aşiq olan var istəməz.

Bu dili-biçarədən sordum nədir dərdinə əm,
Dilbərin lə'lindən ayrı hiç timar istəməz.

Bu könül şəhrini çünki, hicr viran eylədi,
Gəl ki, səndən özgə bir mə'murü me'mar istəməz.

Çün ləbin abi-həyatidir həyati-ömrümün,
Bu Nəsimi səndən ayrı leysə-fiddar istəməz.

Sən mana yar ol ki, könlüm bir dəxi yar istəməz,
Könlümün dildarı sənsən, özgə dildar istəməz.

Cənnəti-ədnin tamaşası rüxün gülzarıdır,
Kim ki, şol gülzarı buldu, özgə gülzar istəməz.

Ta əbəd hirman imiş həqdən nəsibi, hər kim ol
Səndən, ey dilbər, iki aləmdə didar istəməz.

Könlümün məqsudi sənsən, hacəti həqdən budur,
Hacətindən ayru könlüm nəsnə, zinhar, istəməz.

Gəl ki, sənsiz könlüm, ey canü cahanın hasili,
Künfəkanın hasilindən oldu bizar, istəməz.

Sorma, ey dilbər, mana kim, hacətinməndən nədir,
Çünki mə'şuqindən ayru aşiqi-zar istəməz.

Kim ki, zülfünün xəyalı bağladı könlündə, ol
Rahibi-deyr oldu, ondan özgə zünnar istəməz.

Çün, ənəlhəq darını Mənsur olandır istəyən,
Olmayan Mənsur ənəlhəq, leysə fiddar istəməz.

İstərəm aləmdə yarın sirrini faş eyləyim,
Müddəinin canı yanar qəmdən, əğyar istəməz.

Yüzünü bipərdə görmək istərəm daim, vəli
Minkirin görməz gözü, çün kəşfi-əsrar istəməz.

İstədi həqdən Nəsimi vəslini, buldu murad,
Maliki-didar olubdur, gəncü dinar istəməz.

Şəha, könlüm pərişan oldu sənsiz,
Cigərim dopdolu qan oldu sənsiz.

Yəqindir səndən ayrı, şahi-xuban,
Bu könlüm təxti viran oldu sənsiz.

Kimə bənzərsən ey sən, mahpeykər
Ki, aləm bəndi-zindan oldu sənsiz.

Gözüm yaşı cahanı tutdu, ey can,
Görən aydır ki, tufan oldu sənsiz.

Nəsimi quluna qıl çarə, dərman
Ki, canlı gəldi, bican oldu sənsiz.

Gəl, ey dilbər, məni gör kim, necə xoş yanaram sənsiz,
Odundan acı hicranın su oldum, axaram sənsiz.

Xəyalın gəlmiş, ey huri, gözüm qarşısına durmuş,
Fəraqindən yanır bağrım, xəyala baxaram sənsiz.

İki aləmdə məqsudum vüsalinə irişməkdir,
Zəmirim, niyyətim oldur, qaçan fal açaram sənsiz.

Amansız firqətin hər dəm bu viran könlümün şəhrin
Əsasi-rəsmini yıxar, netəkim yaparam sənsiz.

Sulu inculərin şövqi gözümdən axıdar yaşı,
Bu lö'lö mə'dənindən gör nə mərcan saçaram sənsiz.

Gəl, ey məhbubi-ruhani ki, hər dəm boynuma qəmdən
Fəraqin, həsrətin, şövqin ipini taxaram sənsiz.

Nəsimi canını eşqin yolunda eylədi qurban,
Anın adın bu mə'nidən qan ilə yazaram sənsiz.

Dilbəra, şəmsüzzühadır ayəti-rüxsarınız,
Ayəti-tahavü yasin surəti-didarınız.

Qamətin tubadurur, nun vəl-qələmdir qaşların,
Hazihi cənnati-ədnin lə’li-şəkkərbarınız.

Sureyi-vəlleyl zülfün, gözlərin nə’məlbəsər,
Leyk sübhanəlləzi-əsradurur əsrarınız.

Surətin vəşşəms oxuram dəmbədəm ixlas ilə
Ta ki, hüsnünü bəladən saxlasın cəbbarınız.

Qul kəfa billahidir zikri Nəsimi xəstənin,
Həq bilir kim, sümmə-vəchullahdurur didarınız.

Ey camalın ərşi-rəhman qabiə-qövseyn qaşınız,
Nəqşi-ma-əvha yazıbdır hüsnünə nəqqaşınız.

Əhsəni-surətdə, yarəb, sən nə ziba çöhrəsən,
Hurilər oldu qulun, xublar qamu fərraşınız.

Ey üzü cənnət, xəti reyhan, dodağı səlsəbil,
Laməkan bədrü hilalidir üzünlə qaşınız.

Ta ki zülfü qaşlarından gözləri çəkdi çəri,
Oldu kövn ilə məkanın varlığı taraşınız.

Surətindən, ey sənəm, ta görmüşəm həqqi əyan,
Səcdə qıldı üzünə bu aşiqi-qəllaşınız.

Bəhri-zatın gövhərisən, layəzalın surəti,
Laməkan sirrinə xoşdur uşbu gün sirdaşınız.

Üzünü gördü Nəsimi, ey gözüm nuri həbib,
Asitanındır səririm, yastığımdır daşınız.

Mana sənsiz cahanü can gərəkməz,
Vüsalın var ikən hicran gərəkməz.

Ləbi-lə’lin zülal abindən ayru
Şərabi-çeşmeyi-heyvan gərəkməz.

Qəmindir könlümün təxtində sultan,
Bir iqlimə iki sultan gərəkməz.

Yetər dərdin dəva müştaqə, niçün
Ki, dərdin bilənə dərman gərəkməz.

Gülüstanın gülü sənsiz tikandır,
Mana sənsiz gülü reyhan gərəkməz.

Gəl, ey aşiqlərin rizvanı – hüsnün
Ki, sənsiz aşiqə rizvan gərəkməz.

İki aləmdə didarından özgə,
Mana, ey surəti-rəhman, gərəkməz.

Vüsalın şərbətin içən mühibbə
Fərağın ağusu çəndan gərəkməz.

Mana səbr eyləmək sənsiz, nigara,
Əgər müşkil, əgər asan – gərəkməz.

Əzəldə qılmışam eşqinlə peyman,
Bütün peyman, sınıq peyman gərəkməz.

Kəsilməz gərçi vəslindən Nəsimi,
Gözündən olduğun pünhan gərəkməz.

Düşdüm əzəldə zülfünə, dam olmadan hənuz,
İçdim ləbin şərabını, cam olmadan hənuz.

Gördüm üzünü Kə'bədə əhli-səfa ilə,
Qıldım təvafi-Kə'bə, həram olmadan hənuz.

Yazmış üzündə sureyi-rəhman ələssəlam,
Ərş ilə kürsü, lövhü qələm olmadan hənuz.

Gördüm üzünü nuri-təcəllivü şövqünü
Ayü günəşdən nuri-qiyam olmadan hənuz.

Dürdanə dişlərini nigarın görəndə mən,
Dürrə sədəfdə nəzmü, nizam olmadan hənuz.

Vəchində yazmış idi anın yirmi səkkiz hərf,
Xətti-bəyani-hərfü kəlam olmadan hənuz.

Görmüş idi üzündə Nəsimi nişani-həq,
Ol dəm nişani-sübh ilə şam olmadan hənuz.

Lə’lin meyi-ələst idi cam olmadan hənuz,
Xas idi söhbətim dəxi amm olmadan hənuz.

Vermiş idim ana dilü dinü əqlü canımı,
Zülfün kəməndi boynuma dam olmadan hənuz.

Eşqin odu bişirmiş idi dürlü aşlarım,
Sevdası könlümün dəxi xam olmadan hənuz.

Didarını təcəllidə görmüşdü gözlərim,
Musa ilə arada kəlam olmadan hənuz.

Üzün qatında səcdəyi-nisbət qılır idim,
Andan irəli xəlqə imam olmadan hənuz.

Hüsni-rüxün kitabını xətm eyləmiş idim,
Göydən rümuzi-vəhy tamam olmadan hənuz.

Şol tifl kimi canıma vəslin qida idi,
Fitrət günündə vəchi-izam olmadan hənuz.

Rizvan idim əzəl günü ol rövzəyi görüb,
Hurü behiştü dari-səlam olmadan hənuz.

Mən mə’rifət kəlamini nəzm eyləmiş idim,
Əşarü nəzmü nəsr nizam olmadan hənuz.

İrmiş idi Nəsimiyə Fəzlin inayəti,
Kövnü məkanü sübh ilə şam olmadan hənuz.

Həsrət yaşı hər ləhzə qılır bənzimizi saz,
Bu pərdədə kim, nəsnə bizə olmadı qəmsaz.

“Üşşaq” meyindən qılalı işrəti-”Novruz”,
Ta “Rast” gələ çəngi-”Hüseyni”də sərəfraz.

Ba “Çargahi” lütf qıl, ey hüsnü “Büzürgi”,
“Kuçik” dəhənindən bizə, ey dilbəri-”Tənnaz”.

“Zəngulə” sifət nalə qılam zar “Segaha”,
Çün əzmi-”Hicaz” eyləyə məhbubi-xoşavaz.

Ahəngi-”Sifahan” qılır ol nami-”Əraqi”,
“Rəhavi” yolunda yenə canım qıla pərvaz.

Könlümü “Hisar” eylədi ol ruhi-”Mübarğə”,
Gəl olma “Müxalif” bizə, ey dilbəri-”Şahnaz”.

Çun “Şurə” gəlib eşq sözün qıla Nəsimi,
Şövqündən anın cuşa gəlir Sə’diyi-Şiraz.

Gəlgil ki, səndən ayru müştaqə can gərəkməz,
Müştaqə sənsiz, ey can, iki cahan gərəkməz.

Gülzarə, sərvə könlüm meyl eyləməz anunçün,
Qəddindən özgə, ey can, sərvi-cinan gərəkməz.

Şol binişani buldum, anın nişanı oldum,
Üzün görənə ayruq namü nişan gərəkməz.

Gördüm səni gümansız hər dilbərin üzündə,
Həqqül-yəqin görənə zənnü güman gərəkməz.

Çün vasil oldun, ey can, bizimləsən cahanda,
Olduq vüsalə qane, kövnü məkan gərəkməz.

Mişkin saçına çün kim, verdim iki cahanı,
Assiyə uğrayana qılca ziyan gərəkməz.

Qaşınla kirpiyin çün seyd eylədi cahanı,
Səyyad olana ayruq tirü kəman gərəkməz.

Şirin ləbin meyindən çün əsridi Nəsimi,
Faş oldu sirri-pünhan, şərhü bəyan gərəkməz.

Surətin nəqşinə xəyal irəməz,
Gözlərin alasına al irəməz.

Şol qədər safidir ləbin eyni
Kim, anın abinə zülal irəməz.

Bu günü gör ki, rəngü çöhrəsinə
Nə qədər al edirsə, al irəməz.

Gərçi ayı üzünə bənzədərəm,
Qaşların şəklinə hilal irəməz.

Qamətin şoylə mö’tədildir kim,
E’tidalinə e’tidal irəməz.

Ey cəmalül-liqa, nə dilbərsən
Ki, rüxün hüsnünə cəmal irəməz?

Bu nə ziba camal olur, yarəb,
Ki, kəmalatına kəmal irəməz.

Zülfü çün cimü qaşı-dal, vəli,
Zülfü qaşinə cimü dal irəməz.

Necə günəşsən, ey qəmər ki, sana
Ta əbəd zərrəcə zəval irəməz?

Buldu könlum səninlə şol vüslət
Kim, anın vəslinə vüsal irəməz.

Ey Nəsimi, sözün müfərrihdir,
Bu cəhətdən ana məlal irəməz.

Aləmdə bu gün əhdi bütün yar ələ girməz,
Yandırdı tikən bağrımı, gülzar ələ girməz.

Ey xəstə könül, gör nə derəm, məndən eşit pənd,
Dildarə həris olma ki, dildar ələ girməz.

Naqis məhək oldu, qamunun qəlbi dəğəldir,
Bir sikkə dürüst, aricə dinar ələ girməz.

Timarə könül verməgil, ey sayru, həkim ol,
Dərmanını dərd eylə ki, timar ələ girməz.

Ey aşiq, anın zülfünə yapış bu cahanda,
Bir ancalıyın dilbəri-əyyar ələ girməz.

Çün qəm yeyirəm qəm degil, ey aşiq, əgər kim,
Qəm yürəgə kar eylədi, qəmxar ələ girməz.

Gəl çöhrəsinin şəm'inə pərvanə kimi yan,
Anın kimi can yandırıcı nar ələ girməz.

Səyyarə kimi seyr edərəm daim anınla,
Şol seyr edici kovkəbi-səyyar ələ girməz.

Musa kimi gər aşiq isən, könlünü arıt,
Saf olmayacaq ayinə, didar ələ girməz.

Ey axirətin darinə aşiq, bu səradən
Keç kim, bu keçər ərsədə şol dar ələ girməz.

Əlfazi-Nəsimi bu gün ol mö'cüzədir kim,
Bənzər ana bir lö'löi-şəhvar ələ girməz.

Ey üzü gül, ləbləri mərcanımız!
Ey gözü nərgis, şəhi-məstanımız!

Üzünə qarşı sücud eylər mələk,
Səcdəyə inkar edər şeytanımız.

Nunü eynin həq kitabıdır, vəli
Surətin nəqşidürür Qur'anımız.

Surəti-həqdir cəmalın, ey nigar,
Uş nəbinin sözləri bürhanımız.

Xızr əgər zülmətdə istər abını,
Ləblərindir çeşmeyi-heyvanımız.

Şol səfasız sufiyi gör kim, necə
Dəm urar biməʼrifət heyvanımız.

Favü zadü lamdır Fəzli-ilah,
Fəzlinə qurban edəlim canımız.

Hökmünə təslim olur canü könül,
Ey vücudum təxtinə sultanımız!

Ey Nəsimi, gövhərin xərc eyləmə,
Olmayınca müştəri cananımız.

Əhdə vəfa eylədi yari-vəfadarımız,
Yar ilə gör kim, necə düşdü əcəb karımız.

Eşqi-camalın məni kəndüdə məhv eylədi,
Oldu tamam uşbu gün eşq ilə bazarımız.

Qəmzələrin sirrini canda dedim saxlayım,
Daşrə buraxdı könül pərdədən əsrarımız.

Eşqə əlac istəmə, dərdinə səbr eylə, dur,
Gör ki, nə dərman qılır yari-dilazarımız.

Kim ki, səni sevmədi, eşqinə can vermədi,
Yoxdur anın həqqinə zərrəcə iqrarımız.

Zahid əgər aşiqə münkir olur, qəm degil,
Həq bizə oldu əyan, qalmadı inkarımız.

Əhdə vəfa eyləgil, ta deməsin müddəi,
Qövlü qərar üstünə durmadı dildarımız.

Batinə kar eylədi eşqi-rüxün şoylə kim,
Tə'nə urar altunun rənginə rüxsarımız.

Gərçi Nəsimi sözün dadını verdi, vəli
Dadə gətirdi anı ləfzi-şəkərbarımız.

Can eşqə düşdü, ey könül, yarəb, nədir tədbirimiz?
Can neyləsin, biçarə, çün həqdən budur təqdirimiz.

Mişkin saçın eşqi bizi zəncirə çəkdi, bağladı,
Yə'ni ki, biz məcnunlarız, şol həlqədir zəncirimiz.

Saqi ləbindən doğmuşuz, yə'ni ki, beydən lam ilə,
Fitrət günündən ta əbəd şol dayədəndir şirimiz.

Şol gözlərin kirpiginə aşiq necə seyd olmasın,
Gör kim, nə yaydandır gələn şol zəxmə mərhəm tirimiz.

Çün qirü qarın qiymətin mə'nidə bildin kim, nədir,
Kafura döndü qarımız, həm ənbər oldu qirimiz.

Zöhdü səlahü tövbənin ərkanın əhli-zərqə sor,
Eşqə mürid olduq, bu gün eşqi-əbəddir pirimiz.

Dövründə meygun gözlərin abidlərin, zahidlərin
Zikri budur dilində kim, va zərqü va təzvirimiz.

Eşq əhli iqlimində çün hüsnündür, ey dilbər, məlik,
Hökmünə məhkum olmuşuq, sultanımızdır, mirimiz.

Əshabi-kəhfin sirrini görmüş liqayi-Turə sor,
Niçün ki, "vəttur" əhlinin kəhfindədir Qətmirimiz.

Şol sünbüli-pürçin ilə sevdayə düşdüm, nedəvüz,
Tüccariyiz hüsnün, budur kisbatilə kəşmirimiz.

Qur'andır anın surəti, aydır Nəsimi, şək degil,
Münkir əgər yox derisə, uş müshəf, uş təfsirimiz.

Kə'bə üzündür, ey sənəm, üzünədir sücudumuz,
Ta ki, görə bu səcdəyi narə yana həsudumuz.

Şəm'i-rüxün hərarəti yandırır, ey qəmər, bizi,
Uşbu cəhətdən oldu kim, göylərə çıxdı dudumuz.

Canımızı buraxmışız atəşi-eşqə ud kimi,
Ta ki, səfavü zövq ilə eşqinə yana udumuz.

Zülfü qaşınla kirpigin müshəfimizdir, oxuruz,
Ey dilimizdə cümlə sən, göftümüzü şənudumuz.

Zülfü rüxün hesabinə düşmüşüz üştə sayıruz,
Kim nə bilir bu üqdəyi kim, necədir üqudumuz.

Möhbətimiz sifati çün zati-qədimi-fərd imiş,
Vahidi-bizəvalədir mərcə ilə süudumuz.

Qaziyə nəsnə verməriz rüşvət içün bu də'vidə,
Qaziyi-həq qatında çün adil imiş şühudumuz.

Kafilə nun əzəldə çün illətimizdir, ey bəşər,
Gövhəri-laməkan biziz, kim bilisər hüdudumuz.

Surəti-xəttü xalinə sacidü abid olmayan,
Millətimizdə oldurur müşrikimiz, yəhudumuz.

Maü məindən, ey fəqih, əsrəyübən iki demə,
Çünki yeganədəndürür varid ilə vürudumuz.

Düşmən üçün Nəsimiya, olma məlul, qəm yemə,
Oldu əzəl günündə çün Fəzli-əbəd vüdudumuz.

Əcəba, bu huri üzlü məhi-bədr, ya pərimi?
Boyu sərvi-bustani, yanağı güli-tərimi?

Ləbi-canfəzayi-lə’lin urar abi-Xızra tə’nə,
Bu şəkər dodaqlı, yə’ni sözü şilə şəkkərimi?

Düşərəm oda göricək bu mələknijad huri,
Əcəba, bu Çin bütünün üzü nəqşi-azərimi?

Gecələr gözü xəyalı götürər gözümə şəbxun,
Bu gözü hərami cadu, qaşı yaylı çərimi?

Gözü, qaşı, zülfü, xalı ki, iki cahanı aldı,
Qamu bir əmiri-hüsnün sipəhivü ləşkərimi?

Tökülür sözə gəlincə dürü lö’lö ləblərindən,
Əcəb ol sədəf dəhanın dişi nəzmi-gövhərimi?

Saçı ilə həmdəm olmuş bu şikəstədil Nəsimi,
Gəl inanmaz isən uş gör dəmi mişki-ənbərimi.

Mərhəba, ey bəhri-zatın gövhəri-yekdanəsi,
Şəm'i-vəhdətdir cəmalın, kün-fəkan pərvanəsi.

Ta əbəd hüsnün önündə səcdeyi-şükr eylərəm,
Ey cəmalın Kə'bə, sənsən küntə-kənzin xanəsi!

Hər ki, qəvvas oldu bildi vəhdətin bəhrində kim,
Aləmin cismi sədəfdir, sənisən dürdanəsi.

Ey mana, mişkin saçından könlünü qurtar, deyən
Qanğı qafildir, səlasildən çözər divanəsi.

Çünki viran könlüm, ey can, məskən oldu eşqinə,
Istəməz ayruğ imarət könlümün viranəsi.

Dilbərin lə'li əzəl bəzmində içirmiş mana
Şol meyi kim, nöh fələkdir kəmtərin peymanəsi.

Gözləri sevda meyindən aləmi məst eylədi,
Gör nə meydan əsrimişdir nərgisi-məstanəsi.

Ey bu şeyda könlümün halın soran hər dəm mana,
Dərdini bildirməz ol, eşqin oduna yanəsi.

Canımı şükranə verdim şol nigarın vəslinə,
Düşmədi layiq, diriğa, vəslinin şükranəsi.

Zahidin əfsanəsin qo, söylə eşqin halını,
Aşiqin səm'inə sığmaz zahidin əfsanəsi.

Mö'minin Kə'bə yeridir, kafirin bütxanələr,
Aşiqin dost eşigidir Kə'bəvü bütxanəsi.

Buldu lə'lindən Nəsimi nəfxeyi-ruhülqüdüs,
Ey Nəsiminin həyatı, canımın cananəsi.

Vəslin əcəb nə candır kim, canımış bəhası,
Üzün nə nurimiş gör kim, göz qıpar ziyası.

Hər kim səni deməzsə rəhman sifətli həqsən,
Itirmiş ol qaragün həqq ilə həqşünası.

Nəqqaşı nəqş içində hüsnündə gördü zahir,
Güzgüsünün üzündən hər kim gedirdi pası.

Cəmşidi-aləm oldur mə'nidə, ey qəmər kim,
Fərxəndə surətindir cami-cahannüması.

Məstanə gözlərindən düşdü cahana qovğa,
Ağını desəm anın, ya gözləri qarası.

Ala gözündə həq çün yazmış on iki ayət,
Uş müshəf, üştə təfsir, uş eyninin alası.

Ey zahid, uşbu meydən faş oldu sirri-vəhdət,
Tərk et ikiligi kim, bir rəngimiş boyası.

Sufi boyandı alə, alindən olma qafil,
Neçin ki, alı çoxdur zərq əhlinin libasi.

Xubun üzünə baxmaq zahid xətadır, aydır,
Fikri xətadır anın, əgridürür qiyası.

Dünyavü axirətdə azad idim əliftək,
Çəkdi məni bəlaya balasının bəlası.

Səndən səni Nəsimi çün istədivü buldu,
Bildi ki, həq qatında məqbul imiş duası.

Səba zülfün nəsimindən cahanı cümlə can etdi,
Dəmindən gör səba zülfün ki, nə canlar rəvan etdi.

Boyundur sidrəvü tuba, üzündür cənnətü hura,
Xətü xalın kəlam oldu, bu əsrarı bəyan etdi.

Götürdü pəri üzündən yədullah, ey qəmərtəl'ət,
Bu həq dastan ilə gör kim, nə mə'nilər əyan etdi.

Nə gülşəndir üzün bağı ki, rə'na çiçəgi anın
Cahanı rəngü buyindən tikənsiz gülsitan etdi.

Əbirü ənbərü udun sınıxdır qədrü bazarı,
Müənbər zülfünü ta kim, səba ənbərfəşan etdi.

Yaşıl lövh üstünə həqdən yazılmış on iki ayət,
Qaşın vəhyi bu ayatın rümuzun tərcüman etdi.

Rüxün narıdır ol atəş ki, dudi-iştialından,
Kəlimüllah yol bulduvü həq həft asiman etdi.

Qəzadır qaşların qövsi, qədərdir kirpigin səhmi,
Məni amac üçün eyənin bu mə'nidən nişan etdi.

Xətü xalindən, ey dilbər, ələlərş-istiva rəhman,
Budur şol müşkül ayət kim, üqulu bizəban etdi.

Üzündür qibleyi-iman, qaşınla kirpigin Qur'an,
Budur şol abi-heyvan kim, ləbində həq nihan etdi.

Məkanü kanə sığmaz çün qədimin zati-bimisli,
Nəsimi kafü nun oldu, məkanın laməkan etdi.

Gəlgil ki, qapdı şövqi-cəmalın qərarımı,
Zar eylədi fəraqi-rüxün laləzarımı.

Yarəb, zəmanə həqqinə mən neylədim kim, ol
Məndən cəfavü cövr ilə ayırdı yarımı?

Yaxdı fəraqın, ey güli-xəndan, məni oda,
Gəlgil, söndür abi-vüsalinlə narımı.

Vəslin şikarım olmuş ikən bəxti-sə’dilən,
Qaçırdı hasidin gözü məndən şikarimi.

Nəqşü nigarı gör fələkin kim, nə nəqş ilə
Nəqş eylədivü qapdı əlimdən nigarımı.

Mənsuri-eşqə axirətin darı oldu dar,
Ol dara gəl ki, ta görəsən anda darımı.

Düşdüm ləbi vüsali-meyindən xümarına,
Gəlgil həm ol şərab ilə dəf et xümarımı.

Şövqün qışından ağlayıcı küz tökər yaşın,
Vəslin gününə döndərü güldür baharımı.

Ey latə tapıcı, səni eyb etməzəm, nədən,
Kim, görməmişsən ol sənəmi-gülüzarimi.

Sən yarı qılmışam iki aləmdə ixtiyar,
Məndən kim ayruq ala bilir ixtiyarımı.

Xalü xətin şümarını gəl sor Nəsimiyə,
Ta sən hesabını biləsən, mən şümarımı.

Dinin günəşi, dünyada imanım əfəndi,
Alimlər ümidi, məhi-tabanım əfəndi.

Könlüm, gözümün nuru, vücudumda həyatım,
Hər dəm damarımda yeriyən qanım əfəndi.

Cənnət çəmənində salınan huri-nəimin
Gül rayihəli sərvi-xuramanım əfəndi.

Gülnarımü narım, çiçəyim, meyvəli bağım,
Laləm, səmənim, sünbülü reyhanım əfəndi.

Bağım, irəmim, rövzə ilə huri-cinanim,
Bülbüllər üçün tazə gülüstanım əfəndi.

Kanım, gühərim, mə’dəni-yaquti-rəvanım,
Qiymətli olan lə’li-bədəxşanım əfəndi.

Eşqində Nəsimi çü qılır canını qurban,
Qurbanına qurban olayım, canım əfəndi.

Ey nafeyi-Çin saçın siyahı,
Hüsnün dəli qıldı mehrü mahı.

Şəqqülqəmər oldu istivadən,
Şərh eylə bu sirrini kəmahi.

Ey eşqə ədüvvü, hüsnə münkir,
Təzvir ilə çəkmə bunca ahı!

Gər ne'məti-cavidan dilərsən,
Heyvanlara qoy bu abü kahı.

Ey eşqə günah deyən günahkar,
Tərk eyləməzəm mən ol günahı.

Çün vəhdətə buldu yol müvəhhid,
Cərh oldu bu münkirin güvahı.

Məqsudunə bulmadı hidayət,
Hər kimsə ki, bilmədi bu rahı.

Mislivü nəziri yoxdur anın,
Vəsfində nə söyləyim, ilahi?!

Şol başə ki, taci-dövlət endi,
Neylər kəməri, nedər külahı?

Sultandır iki cahanda şol kim,
Fəzli-həq ola anın pənahı.

Məhv oldu Nəsimi eşq içində,
Dəryayi-mühitə düşdü mahi.

Sufi nə bilir rümuzi-rindan,
Çün çəkmədi bər səri-sürahi.

Qaşın vəhyi bizə bürhan irişdi,
Üzündə tə'vili-fürqan irişdi.

Üzündür həq kitabı-vəhyi-mürsəl,
Zəhi dövlət sana həqdən irişdi.

Qaşınla kirpigin Turun dağında
Necə bir Musiyi-Imran irişdi.

Aşiq öz dərdinə çün buldu dərman,
Həzaran hikməti-Loğman irişdi.

Necə bir hikmət ilə tökdü qanın,
Neçənin dərdinə dərman irişdi.

Fənayi-mütləq oldum eşq içində,
Əzəldən çün tənə ol can irişdi.

Itirmə Misrini sən, ey Nəsimi,
Bu Misrə Yusifi-Kən'an irişdi.

Cənnəti-ədn imiş üzün, üştə ləbin də kövsəri,
Qədrü bərat imiş saçın, xalü xətin mələkləri.

Qaliyəbu saçınla çün can ilə vüslət etmişəm,
Çini-tatarı bulmuşam ud ilə mişkü ənbəri.

Mə'dəni-ruh əgər desəm ləblərinə, əcəb degil,
Cövhəri cövhəri bilir, sən mana sor bu cövhəri.

Hüsnü cəmali-surətin qiblədir, uşbu mə'nidən
Surətinə sücud edər ay ilə şəmsi-xavəri.

Can ilə kim ki, könlünü eşqinə qılmadı vətən,
Divə müsəlləm eylədi məmləkəti-Skəndəri.

Dairəsində sünbülün nöqtə günəşdir, ay ilə,
Gör nə imiş bu nöqtənin daireyi-müdəvvəri?

Lövhi-zəmirə nəqşini sübhi-əzəldə yazmışam,
Məhv eləməz bu səfhədən kimsə bu nəqşi-peykəri.

Üzünə qarşu, ey mələk, hüsnünü öymə kim, ana
Ay ilə gün sücud edər, anda pərin tökər pəri.

Kişvəri-əmnü afiyət, mə'rifətin kilididir,
Ey məliki-zəmanə, gəl fəth edə gör bu kişvəri.

Həşrü hesabü məhşərə qail isən, gəl üştə gör
Həlqələrində zülfünün şol ərəsati-məhşəri.

Gülşəkəri nə vəch ilə ağzına nisbət eyləyim
Kim, xəcil eylədi ləbin bal ilə qəndü-şəkkəri.

Dil bəri eylə, ey könül, keç qamudan ki, qamudan
Eyləməyincə dil bəri, bulmadı kimsə dilbəri.

Eşq ətəgin tut, ey könül, başını sal ayağına,
Gör nə derəm sana, eşit, eşqə yapışma sərsəri.

Anda imana gəlməyən bilmədi sirri-Əhmədi,
Bunda Əli gərək, əli ta yıxa babi-Xeybəri.

Mə’rifət əhlinə üzün Kə’bə, Bilali bənlərin,
Mehrab can quşun, vəli eynin imami-Cə’fəri.

Çəkdi saçı Nəsimiyi çənbəri-eşqə, neyləsin,
Çənbər anındır, oynasın dövri-qəmərdə çənbəri.

Gözlərim yarın qəmindən axıdar dürdanəyi,
Qəmdə yanar daima, gör aşiqi-pərvanəyi.

Canını tərk eylə kim, bu yolda canan bulasan,
Kim ki, can verdi bu yolda, buldu ol canànəyi.

Nəqlini ərz etmə, vaiz, aşiqə hər dəmbədəm,
Aşiqin halını bil, qoy bu uzun əfsanəyi.

Gəl şərabi-xəmri nuş et, içmə hər peymanədən,
Ta əbəd yarın qəmindən içmişəm peymanəyi.

Çünkim aydırsan həqi hər yerdə hazırdır, neçin
Fərq, ey qafil, edərsən məscidü meyxanəyi?

Gəncü mə’mur eyləyən könlümdə yarın vəslidir,
Vəsl ilə mə’muri buldum, neylərəm viranəyi?

Istərəm çünkim bulunmaz saçının hər tarəsi,
Gizləmişdir, qafil olma, zülfi-mişkəfşanəyi.

Zülfünün sevdası irdi aşiqi-divanəyə,
Zülfünə qıldı müqəyyəd aşiqi-divanəyi.

Mə’rifət satır gəlir hər mə’rifətsiz canəvər,
Bibəsərdir, aşina bilmə qo bu biganəyi.

Çün cəmalından Nəsimi əbcədi qıldı tamam,
Oxudu andan götürdü sinü şin dəndanəyi.

Mahi-tabandır üzün, ey afitabi-xavəri,
Təl’ətindən münfəildir şəmsü mahü Müştəri.

Zöhrədir alnın, nigara, qaşların qövsi-qüzeh,
Xətti-səbzin zülfün ilə Cəbrəilin şəhpəri.

Ərşi-ə’zəmdir cəmalın, sidrə boyun, ey günəş,
Surətin cənnati-ədnin, ləblərindir kövsəri.

Müshəfi-həqdir üzün mə’ni içində bixilaf,
Zülfü qaşü kirpigindir ol kitabın xətləri.

Görk içində fərdi-yektasan, əya məhbubi-dil,
Şol cəhətdən səcdə qıldı hüsnünə hurü pəri.

Dil bəri qıldım sənin qeyrindən, ey can parəsi,
Anın üçün, çün sən oldun xəstə könlüm dilbəri.

Ey Nəsimi, səcdə qıl hüsnünə qarşu dilbərin,
Çünki, xublar surətidir həq-təala məzhəri.

Rəvamıdır, rəvamıdır, həbibi
Ki, oda yandırasan mən qəribi?

Məni bu dərdi-eşqə sən buraxdın,
Yenə sənsən bu dərdimin təbibi.

Cəmalın gülşənindən haşalillah
Ki, məhrum döndərəsən əndəlibi.

Qaşın mehrabına baş qoymayanlar
Məgər boynunda bağlıdır səlibi.

Canımdan kəsmişəm, dilbər, ümidi,
Vəli səndən kəsə bilməm rəqibi.

Yaza kirpiklərin, nəsrən minallah,
Oxur dodaqların fəthən qəribi.

Nəsiminin bu xublar filqətindən
Cəfavü dərd imiş ancaq nəsibi.

Bağrımnı dəlür navəki-hicrani-filani,
Qanımnı tökər sehr ilə çeşmani-filani.

Başdan ayağa külli-vücudum oda yandı,
Yarəb, yaraya dərdimə dərmani-filani.

Şahın quluyam, eyləmişəm yüz kərə iqrar,
Bel bağlamışam bəndə bəfərmani-filani.

Sundum əlimi damənınə bəs ki, dutaydum,
Bağladı qapu, qoymadı dərbani-filani.

Billah, sərü can cümlə bəşükranə verərdim,
Gər olsa idim bir gecə mehmani-filani.

Ənbər saçılır, zülfünü gər şanə qılırsa,
Şəkkər tökülür əz-ləbü dəndani-filani.

Bu şəhri qoyub üştə gedər xəstə Nəsimi,
Bədnami-cahan oldu bədövrani-filani.

Könül sarayına mehri buraxdı ta tabi,
Gözümdən oğru xəyalın oğurladı xabı.

Cigər damarı gözündən yol eyləmiş çeşmə,
Bu babdən cigəridir bu çeşmənin abı.

Müdam cami-ləbin həsrətindən axar yaş,
Bəbəkləri qədəhindən şərabi-innabı.

Gözüm səvadinə girmiş bənin kimi nəqşin,
Qaranqudan necə bulmuş bu oğru ol babı?

Cəmalını diləyən ayə iltifat etməz,
Kim arzulaya günəşin qatında mehtabı?

Şərabi-lə'linə saqi əcəb, nə qatmışdır
Ki, bixud edərü mədhuş şeyx ilə şabı?

Götür niqabı, cahanı cəmali-hüsn ilə dut
Ki, bəylik etməyə cəm eyləmişdir əsbabı.

Təbəssümə gəlicək gül kimi dodaqların,
Ziyafətində qılır qərqə şəkkəri-nabı.

Fəraqi-cövrünə qatlan, Nəsimi, gəl səbr et,
Ola ki, açıla bir gün vüsal əbvabı.

Ənbərin zülfün, nigara, bağladı divanəni,
Şəm’i-vəhdətdir camalın, yandırır pərvanəni.

Ey üzün qədrü cəmalın rəhmətən lil-aləmin,
Məscidə varman bu gün, arzulaman meyxanəni.

Abi-kövsərdir dodağın, mə’dəni-ruhülqüdüs,
Aşiqə sun arifanə, saqiya, peymanəni.

Zahidi-zərraqı hər dəm oda yandırmaq gərək,
Gərçi məndən eşidərsən şeyx həm mövlanəni.

Ey Nəsimi, satmagil sən cahilə dürri-ədən,
Cahilü nadan nə bilsin qiyməti-dürdanəni.

Dərdmənd etdin məni, ey dərdə dərman erməni,
Olmuşam eşqin yolunda bəndəfərman, erməni.

Nə pəri, nə adəmi bu şəkl ilə mən görmədim,
Cənnəti hurimisən, yoxsa ki, rizvan, erməni?

Anca kim, sə'y eylədim nazik camalın görməyə,
Zərrəcə yumşalmadın, ey könlü zindan erməni.

Örtgil ol ay üzünü kim, çeşmi-naməhrəm görər,
Yoxsa ki, dindən dönər çox-çox müsəlman, erməni.

Isayi-Məryəm həqiçün, heç qərarım qalmadı,
Didəmi giryan edərsən, bağrımı qan, erməni.

Qorxuram mən dərvişə sən deyəsən din tərkin et,
Necə ki, bağladı zünnar Şeyx Sən'an, erməni.

Xanda bir xaç əhli varsa qamusun seyr eylədim,
Bulmadım mən sən təki bir cani-canan, erməni.

Bir sual etdi Nəsimi sən büti-mehparədən,
Lütf ilə söyləşə gör, ey lə'li xəndan, erməni.

Firqətin dərdi, nigara, bağrımı qan eylədi,
Ruzigar oldu müxalif, vəsli hicran eylədi.

Canımı, yə'ni vüsalından kim, ayırdı fələk,
Gəl bu cansız aşiqi gör kim, nə bican eylədi.

Bağrımın qanın gözümdən axıdar hər dəm qəmin,
Ey sənəm, şövqün məni gör kim, nə giryan eylədi.

Dərdimin dərmanını fəzlindən Allah eyləyə,
Hər dəvasız dərdə çün oldur ki, dərman eylədi.

Sirri-eşqin gəncimiş, anın yeri viranədir,
Yıxdı eşqin könlümü, ol gənci viran eylədi.

Səndən ayru düşdügüm məndən degil, təqdirimiş,
Həqdir, ey can, hər nə kim, təqdiri-yəzdan eylədi.

Canını verdi Nəsimi çün saçın zəncirinə,
Neçin anın məskənin zəncirü zindan eylədi?

Ey badi-səba, məndən ilət yarə səlamı,
Şol qəmzələri ərbədəcu, eyni həramı.

Müştaqə nədir çarə, mana bildir, anı et,
Gər fürsət ola yarə dəgirmək bu pəyamı?

Yandırdı məni yandırıcı firqəti anın,
Bir daxi qanı kim, görüm ol mahi-təmamı?

Zülfündənü xalından anın ayruyam, ayru,
Ey həq, mana ver sən yenə şol danəvü damı.

Məqsudi kimin kim, iki aləmdə nə sənsən,
Məqsudunu itirdivü fəth olmadı kamı.

Mə’nidə üzü qiblədə ol arif imiş kim,
Üzündür anın qibləsi, eynindir imamı.

Ol lövhdü, ey üzü qəmər, gül yanağın kim,
Ruhülqüdüs ol lövhdən endirdi kəlamı.

Bəzmində əzəl saqisi lə’lin mana sunmuş,
Ol badəyi kim, ruhül-əmindir dolu camı.

Vəslin əbədi bəxt imiş, amma nə deyim kim,
Dövranı degil baqivü peyvəstə davamı.

Hüsnün quludur cümlə əgər mahisə, gər xur,
Ey lə’linə can bəndəvü yazuqlu qulamı.

Namusa məni də’vət edər nasehü namə,
Ey xacə, nədir aşiqə namus ilə namı?

Vəsfində Nəsimi sözünü ərşə çıxardı,
Qanğı sədəfin incisi buldu bu nizamı.

Şərbətin acı firqətin nuş edərəm şəkər kimi,
Canımı dutmuşam qəmin qarşısına sipər kimi.

Yaxma məni fəraqilən, çünki mən, ey üzü qəmər,
Xalisü müxlis olmuşam eşqi-rüxündə zər kimi.

Qurmağa qoyma yayını, salma məni fəraqə kim,
Doğramış oxları anın yürəgimi zəhər kimi.

Ta bilələr ki, məğribin günəşi doğdu, ey qəmər,
Türfə niqabını götür, xalqa görün qəmər kimi.

Kim ki, mələk kimi sana qılmadı səcdə, ey sənəm,
Ta əbəd adı div imiş münkiri-bibəsər kimi.

Gərçi hidayət eylədi Musayı nara ol şəcər,
Aşiqə hadidir üzün, nuruna ol şəcər kimi.

Sidqü səfavü zövqilən həqqə ulaş və vasil ol,
Zənnü gümanə möhtəmil olma əgər-məgər kimi.

Səndən əzəldə, ey qəmər, aşiqə gəldi bir xəbər,
Bir dəxi səndən istərəm, ancılayın xəbər kimi.

Xalü xətin Nəsimiyi oda buraxdı, yandırır,
Gör necə xoş yanar, tütər, mişk ilə udi-tər kimi.

Camalın rövzeyi-rizvan deyilmi?
Dodağın çeşmeyi-heyvan deyilmi?

Səqahüm rəbbihüm xəmri ləbindən,
Bəyanü ayəti-Qur'an deyilmi?

Rüxü zülfün bəyaz ilə səvadı,
Biri küfrü biri iman deyilmi?

Sənin məstanə eynin sağərindən
Cahan sərtasəri məstan deyilmi?

Şəha, eşqin yolunda canı qurban
Buyursan, qılmağı asan deyilmi?

Dili-sərgəşteyi, sultani-aləm,
Səninçün ta əbəd heyran deyilmi?

Nəsimi kəşfi-əsrarını bildi,
Anı fəhm etməyən nadan deyilmi?

Mərhəba, xoş gəldin, ey dildar, xoş gördük səni,
Xoşmusan, ey bərgüzidə yar, xoş gördük səni.

Doğrusu, müştaq idik, cana, bəsi didarına,
Ey gözü nərgis, üzü gülnar, xoş gördük səni.

Gəlməyə çün afitabü getməyə çün mahitab,
Haliya, ey kövkəbi-səyyar, xoş gördük səni.

Müddəilər tə’n urarlar irqətindən halıma,
Bir dəxi bər kuriyi-əğyar, xoş gördük səni.

Dərdimənd olmuş idi miskin Nəsimi sənsizin,
Ey vüsalın dərdimə timar, xoş gördük səni.

Ayrılıqdan yar mənim bağrımı büryan eylədi,
Özünü bir yana saldı, məni bir yan eylədi.

Zə'fərana bənzimi göndərdi ol birəhm yar,
Düşməni xəndan edib, dostunu giryan eylədi.

Aldı könlüm, qılmadı ol bivəfa bir gəz vəfa,
Yıxdı mə'mur şəhrini, gör necə viran eylədi
.
Canımın zəxmindən, ey can, xab gəlməz eynimə,
Cigərimdə zəxmi-peykan, tiri-müjgan eylədi.

Eşidərsə daş ərir həsrətdə ahü zarımı,
Ol güləndam yarı gör, könlümü zindan eylədi.

Cəhd qıldım çox, vüsalə yetmədim, çəkdim fəraq,
Tədbir ana neyləsin, təqdiri-yəzdan eylədi.

Ey Nəsimi, sübhdəm var, ərz qıl dildarə sən,
Qəmzəyə versin nəsihət, yoxsa çox qan eylədi.

Apardı könlümü məndən bu gün ol cənnətin huri,
Götür pərdə camalından ki, sənsən eynimin nuri.

Bu gün yövmilhesab oldu üzün dövründə, ey məhru,
Məgər qopdu qiyamətlər, görə bilmən bu məzmuri.

Minacat eylərəm dünü gün sənin dövlətli kuyində,
Üzün nuri-təcəllidir, dəxi mən neylərəm Turi.

Saçın həblül-mətinindən, nə qəmdir boynuma taxsan,
Vəli me’raci-zülfündə asıldı, gör bu Mənsuri.

Fəraqü mövnəti-hicrin yıxıbdır könlümün şəhrin,
Nola bir gəz vüsalınla yapasan Beyti-mə’muri.

Şəha, lə’lin şərabından Nəsimi şoylə sərxoşdur,
Olubdur valehü heyran, diləməz abi-ənguri.

Hüsnünə sübhanəhü kim ki, şəhid olmadı,
Talevü bəxti anın bil ki, səid olmadı.

Sidq ilə hər kimsə kim, tutmadı eşqin yolun,
Salikü abid degil, şeyxi-rəşid olmadı.

Həmdü sipas eylərəm hüsnünə, ey bibədəl,
Hüsnünə həmd eyləyən qeyrə həmid olmadı.

Surəti-rəhmanı bil, tanı anın ərşini,
Bilməyən ol surəti, ərşi-məcid olmadı.

Üzünə, ey nuri-həq, səcdə qılan ta əbəd,
Adı mələkdir anın, divi-pəlid olmadı.

Səltənətin zövqünü arifə sor kim bilir,
Ismi məlik, əbdüküm eşqə əbid olmadı.

Kəşfü kəramətinə mənzələti-övliya,
Bulmiyəsər, hər kim ol eşqə mürid olmadı.

Hər gecəsi, hər günü qədr ilə bayram olur,
Vəslinə hər kim qərib oldu, bəid olmadı.

Nəhnü qəsəmnada həq hər nə ki, qism eylədi,
Zərrəcə ol qisminə nəqsü məzid olmadı.

Gərçi saçın vəslidir zilli-mədid, ey günəş,
Zahidə şol cənnətin zilli mədid olmadı.

Uğramadı hüsnünün atəşi şol cana kim,
Şol günəşin tabına cismi qədid olmadı.

İnnə-əzabin-şədid ayəti hicran imiş,
Şiddəti-hicran qaçan sə’bü şədid olmadı?

Sən ki, həqdən özünü ayrı sanırsan, məgər
Səndə üsul ayəti həbli-vərid olmadı?

Kim ki, Nəsimi kimi vahidü fərd olmadı,
Vahidi-mütləq degil, zati-vəhid olmadı.

Ta ki, gəldi eşqin, ol mənliyi məndən qapdı,
Bu xərabı qıldı mə’mur, xoş imarət yapdı.

Məskənət saldı xəyalın könlümün viranına,
Tərcüman qılsa gərəkdir gənci-məxfi tapdı.

Zahida, inkara düşmə, olalım iqrari-eşq,
Çün əzazil münkir oldu, əgri yola sapdı.

Əjdəhayı göricək Musa əsasın daşladı,
Əjdəha oldu əsası, əjdahayı qapdı.

Zülfünüz çəkdi çəri gəldi Xəta, Çin üstünə,
Xalınız qopdu Həbəşdən Rum elini çapdı.

Mustafanın mö’cüzündən iki şəqq oldu qəmər,
Heybətindən Heydərin dağlar yerindən qopdu.

Can fəda qıldı Nəsimi əz dəmi-Fəzli-ilah,
Başını top eylədi, çövkanın aldı çapdı.

Candan çıxarmazam sənin, ey can, xəyalını,
Can təndə qalmaz anda ki, görsəm camalını.

Elmü hədisü ayəti-fürqan sorar zi mən,
Ağ üzün üstə görmüşəm ol xəttü xalını.

Cəhd et macalın əldə ikən yara yara kim,
Bir gəz əcəl irər dəxi verməz macalını.

Ey dünya, mən yenə səni bildim, yalançısan,
Aldanmazam sənə dəxi çün bildim halını.

Vəhdət dəmində dərvişü sultan çü bir imiş,
Gəl, xəstədil Nəsimi, qəbul eylə şalını.

Ləblərin şərbətinə çeşmeyi-heyvan susadı,
Sulu incilərinə təşnə kimi can susadı.

Şəkkərin püsteyi-dəndanına kim susamaya?
Sanma kim, yalqız ana püsteyi-xəndan susadı.

Ənbərin sünbülünə badi-səhərgah əsicək,
Vəslinə laleyi-sirab ilə reyhan susadı.

Sözünün dadına şirin şəkər oldu təşnə,
Nə şəkərdir bu kim, ana şəkəristan susadı?

Cövrü bidad ilə tökdü cigərim qanını yar,
Şöylə bənzər ki, cigər qanına canan susadı.

Necə qəhr eyləyəsən, aşiqinə rəhm eylə
Ki, sənin rəhmətinə aşiqi-heyran susadı.

Sayru oldum, kərəm et, aşiqini sormağa gəl
Ki, könül vəslinə, ey dərdimə dərman, susadı.

Susadım vəslini görməkliyə, ey cani-cahan,
Şöylə kim, Yusif üçün Yə'qubi-Kən'an susadı.

Sallanub naz ilə gəlgil ki, mənim didələrim
Ayağın tozuna, ey xosrovi-xuban, susadı.

Gül kimi gülə-gülə gəl aradan pərdə götür
Ki, üzün görməginə dideyi-giryan susadı.

Dur, Nəsimi, sözünü töhfə üçün bəhrə ilət
Kim, anın diqqətinə dürr ilə mərcan susadı.

Camalın fitnəsi tutdu cahanı,
Çıxardıb pərdədən razi-nihanı.

Nedər aşiq cahanü canı sənsiz,
Ki, sənsən aşiqin canü cahanı.

Ləbindir çeşmeyi-heyvan, vəli şükr
Ki, hər heyvantəbiət bilməz anı.

Ləbi-lə'lin şərabın içənə sor
Ki, kimdir içən abi-zindəganı.

Susamış qanıma lə'lin eşitdim,
Bu dövlət aşiqi-miskinə qanı?

Görün kim, qəmzəsilə yuxusundan
Oyardı fitneyi-axırzamanı.

Əgərçi binişansan, kimsə hərgiz
Nişansız bulmamışdır binişanı.

Vüsalındır, vüsalındır, vüsalın,
Nəimi-xüldü ömri-cavidani.

Nəsiminin məkanı laməkandır,
Məkansız aşiqin həqdir məkanı.

Camalındır həqqin zatü sifatı,
Müənbərdir boyun qədrü bəratı.

Könül bir nöqtədir, eşqi yəmində
Bitirdi bəhri-eşqin kainatı.

Sənin şirin sözün ta Misrə düşdü,
Əritdi şəkkərü qəndü nabatı.

Xuraman qamətindən sidrə, ey dust,
Əyildi çənbər oldu şeş cahatı.

Kimin dərmani-dərdi sən deyilsən,
Həbadır, hərzədir zöhdü səlatı.

Nəsimi ta ki, oldu həqqə vasil,
Xızrnın çeşməsi bolmuş həyatı.

Sənəma, üzün gülündən gülə-gülə gül utandı,
Xəcil eylədi dodağın şəkəri, nabatı, qəndi.

Qara qaşların yayından mana kirpik oxun atar,
Ala gözlərin məgər kim, yenə qanıma susandı.

Sitəm etmək ilə haşa ki, könül usana səndən,
Kimə aydayım ki, anın sitəmində can usandı.

Gözünü düzüb süzərsən, dilü cana qəsd edərsən,
Bu nədir ki, sən qılırsan, çələbim, bəgim, əfəndi?

Nə bahaya qiymət etsəm səni, ey şikari-dövlət
Ki, cahan mətahi dəyməz qılına saçın kəməndi.

Dünü gün iki gözümdən axıdır ənar danə,
Cigərim qanilə gör kim, bu yüzüm nə xoş boyandı.

Qara sünbülün niqabı ki, hicabı düşmüş aya,
Götür, ey sənəm, üzündən ki, Nəsimi oda yandı.

Zülfün gecəsi qədrdürür, al yanağın ay,
Me'rac üzün, sidrə boyun, qaşın iki yay.

Aləmdə səni qıldı könül kəndinə məqsud,
Fikri nə ulu nəsnə, zəhi əqlü zəhi ray.

Əndişə ilə əqlim iki aləmi gəzdi,
Sənsiz netəkim istədilər bulmadılar cay.

Hər kim ki, saçın küfrünə iman gətirməz,
Mö'min degil ol dinin itirmiş, ona çox vay.

Ol başı ki, bəxt eyləmədi eşqinə qurban,
Dəyməz ayağın tozuna, ey sərvi-dilaray.

Mütrib kimi hər ləhzə ənəlhəq dili söylər,
Ey nayə giriftar olan, dur yenə çal nay.

Vəsfində Nəsimi deyil ol zat kim, anın
Mislin görələr, ya bulalar zatına həmtay.

Yandırdı eşqin bağrımı, səndən mana dərman gərək,
Gərçi yolunda aşiqin canü dili suzan gərək.

Düşdüm yenə eşq oduna, büryan yürək, giryan gözüm,
Hər kim ki, düşdü eşqinə, büryanü həm giryan gərək.

Sun saqiya, kasən rəhiq, çal mütriba, eşq əzgüsün
Kim, məst olan bu badədən qəltanü həm heyran gərək.

Qalu bəladə can sana qılmışdı iqrar, ey sənəm,
Imdi aramızda bizim şol əhdü şol peyman gərək.

Şövqən tərani sirrini mən söyləyəydim, neyləyim,
Məhrəm bu Turin sirinə Musa ibn Imran gərək.

Hər kim vücudu şəhrini gəzdivü gördü şəhnəsiz,
Yarğu anındır, ey sənəm, ol sahibi-divan gərək.

Könlüm quşu əsfəldədir, vəqt oldu pərvaz eyləyə,
Simurği-qafə qürb olan ərş üstünə cövlan gərək.

Mən qul olanın quluyam, altun olanın puluyam,
Hər kim bu yolda quldürür aləmdə ol sultan gərək.

Görsət üzünü bir kərə, ta kim, Nəsimi can verə,
Çün eydi-əkbərdir üzü, yüz can ona qurban gərək.

Cana, üz istivasına şəqqül-qəmər gərək,
Ol mö'cüzün bəyanına xeyrül-bəşər gərək.

Musasifət təcəlliyi-didar üçün sana,
Hüsn ilə qamətin kimi Turü şəcər gərək.

Əhya qılır əgərçi dəmin ölü, ey sənəm,
Xəlvətnişinə şahidü şəm'ü şəkər gərək.

Başımı top edib, şəha, meydanə girmişəm,
Meydanə girməgə yenə mərdanə ər gərək.

Hər bibəsər səni neçə yol bula görməyə,
Uçmaqda rö'yətə dəxi əhli-nəzər gərək.

Napak olan sənin nə bilir qədrü qiymətin,
Zatında adəmin dəxi arı göhər gərək.

Qismət, Nəsimi, olmayacaq yara kim irər,
Yara irişməgə yenə yardan xəbər gərək.

Hüsnünə heyrandurur hurü mələk,
Eşqinə sərgəştədir daim fələk.

Vüslətin mana müyəssər olmadı,
Netəkim yolunda çəkdim çox əmək.

Mən qula rəhm et, şəha, çox gəz dedim,
Keçmədi tapın qatında bir dilək.

Həsrətindən qəm yerisəm mən nola,
Aşiqin daim işidir qəm yemək.

Şol şəkərdildən rəvamıdır, şəha,
Mən mühübbə sən acı söz söyləmək.

Gözlərimin bəhrinə qərq olmuşam,
Netəkim seyr edərəm misli-səmək.

Ey Nəsimi, aqibət varır yelə,
Bivəfa ilə yeyən nanü nəmək.

Çəkəli əynimə bu sikkeyi-mərdan kəpənək,
Biləsən, qıldı mənim dərdimə dərman kəpənək.

Kəpənək geydiyimə kimsələr eyb eyləməsin,
Kim ki, halıma mənim qılmadı nöqsan kəpənək.

Kəpənək geymişəm, əndişədən azad olubam,
Üşümək müşkülünü eylədi asan kəpənək.

Mə’rifət əhlinə gəldi kəpənək ətləsi-xas,
Nə rəvadır ki, geyə cahilü nadan kəpənək.

Ey Nəsimi, yeri gey, xirqə ərənlər donudur,
Geymədi münkir anı, sandı ki, zindan kəpənək.

Firqətindən, dilbəra, könlüm pərişan oldu, gəl!
Qıl kimi cismim mənim əz dərdi-hicran oldu, gəl!

Ta ki, sən getdin, mən oldum dərdiməndi-müstəmənd,
Dərdimə görklü camalın cana dərman oldu, gəl!

Qalmadı çeşmimdə nəm əzbəs ki, ağlarmən müdam,
Didəmin yaşı qurumaz, bəhri-ümman oldu, gəl!

Yoluna baş qoymuşam zarü nizarü xəstədil,
Ey təbibim, gəl ki, cismimdən cüda can oldu, gəl.

Firqətindən uş Nəsimi dəmbədəm qılır fəğan,
Ölürəm hicran qəmindən, cigərim qan oldu, gəl!

Firqətin yandırdı bağrımı, yürəgim qan oldu, gəl!
Gəl ki, didarın bu sayru cana dərman oldu, gəl!

Dünyanın nazü nəimi, bağü bustanı mana
Sənsiz, ey sultani-xuban, bəndü zindan oldu, gəl!

Istədi lə'lin fərağı canımı yaxmaq, vəli
Şövqə yanmış cana vəslin abi-heyvan oldu, gəl!

Ol könül ki, daima işi səninlə vəsl idi,
Yandı şövqündən, əsiri-dərdü hicran oldu, gəl!

Canımın canı vüsalındır, vüsalından anı
Ta kim, ayırdı fələk, biçarə bican oldu, gəl!

Aşiqin bağü gülüstanı üzün gülzarıdır,
Qanğı gülzarın adı gülsüz gülüstan oldu, gəl!

Mö'cüzatından yanağun, möhkəmatından saçın,
Xarü xaşakı cahanın vərdü reyhan oldu, gəl!

Bəhri-bipayana şövqün canımı qərq eylədi,
Gör nə bidad eylədi hicrin, nə tufan oldu, gəl!

Cənnətin səhnində tuba valehü aşüftəhal,
Qamətin hüsnilə, ey sərvim, xuraman oldu, gəl!

Ta məni təqdiri-yəzdan eylədi səndən cüda,
Könlümün halı pərişan, didə giryan oldu, gəl!

Çün Nəsimi səndən ayrı bildi kim, yoxdur vücud,
Küfrü iman, vəslü hicran cümlə yeksan oldu, gəl!

Firqətin dərdindən, ey can, yürəgim qan oldu, gəl!
Gözlərim yaşı cahanı dutdu, tufan oldu, gəl!

Canımın vəslinlə həqdən ittisalı var ikən,
Dövləti-vəslindən ayru düşdü, hicran oldu, gəl!

Çəkdi mişkin zülfünü, aldı əlimdən ruzigar,
Şol səbəbdən könlümün halı pərişan oldu, gəl!

Gərçi məndən surətin qaibdir, ey huricamal,
Sanma kim, gözdən camalın nəqşi pünhan oldu, gəl!

Firqətin şol dərd imiş canımda kim, hər kimsə kim,
Fikrinə düşdü bu dərdin, əqli heyran oldu, gəl!

Səndən ayrı düşdügüm ağulər içirdi mana,
Vüslətin tiryakı qanı, vəqti-ehsan oldu, gəl!

Xızr əgər zülmətdə istər çeşmeyi-heyvanını,
Susamış müştaqə lə'lin abi-heyvan oldu, gəl!

Gərçi xəndandır fərəhdən ağzı açılmış gülün,
Əndəlibin gözlərin gör kim, nə giryan oldu, gəl!

Yar cövr etmiş Nəsimiyə, rəvadır gər ana,
Öz nigarından cüda zəncirü zindan oldu, gəl!

Yarın cəfası cümlə vəfadır, cəfa degil,
Yarım cəfa qılur deyən əhli-vəfa degil.

Mə’şuqu hər nə qılsa rəvadır mühibbinə,
Illa fəraq oduna yaxmaq rəva degil.

Hər kimsənin ki, qibləsi, ey can, sən olmadın,
Irağə düşdü Kə’bədən, əhli-səfa degil.

Eşqin əgərçi adını aqil bəla qomuş,
Nə’mülbəladır əhlinə, bə’sülbəla degil.

Qanı cahanda, ey könül, ol vəhdət əhli kim,
Yüz min bəlavü möhnət ilə mübtəla degil.

Səbrin şərabi gərçi müfərrihdir, ey həkim,
Aşiqlərin davası bu acı dəva degil.

Ey sevmə əhli-hüsnü camalı, deyən mana,
Görməz gözün bu gözü əcəb, gər ə’ma degil.

Surətdə adəm oğluvü mə’nidə div olan
Oldur ki, həqqi tanımamış, aşina degil.

Surətdə gərçi bənzişi çoxdur Nəsiminin,
Mə’nidə adı hər həcərin kimiya degil.

Üzünü məndən nihan etmək dilərsən, etməgil!
Gözlərim yaşın rəvan etmək dilərsən, etməgil!

Bərgi-nəsrin üzrə mişkin zülfünü sən dağıdıb,
Aşiqi bixaniman etmək dilərsən, etməgil!

Qaşların qövsündə müjganın xədəngin gizləyib,
Ey gözü məstanə, qan etmək dilərsən, etməgil!

Canımı vəslin şərabından ayırdın, ey gözüm,
Eynimi gövhərfəşan etmək dilərsən, etməgil!

Qoymuşam eşqində mən kövnü məkanın varını,
Can nədir kim, qəsdi-can etmək dilərsən, etməgil!

Bürqəi üzündən açarsan məgər naməhrəmə,
Gizli əsrarı əyan etmək dilərsən, etməgil!

Yandırırsan könlümü eşqində, mə'lum oldu kim,
Anı risvayi-cahan etmək dilərsən, etməgil!

Doğruyam eşqində oxtək, kirpigin tanıqdurur,
Qəddimi neyçün kaman etmək dilərsən, etməgil!

Çünki eşqin məskənidir könlümün viranəsi,
Həsrətə anı məkan etmək dilərsən, etməgil!

Çün yəqin bildi Nəsimi ağzının var olduğun,
Ol yəqini sən güman etmək dilərsən, etməgil!

Zülfünü ənbərfəşan etmək dilərsən, etməgil!
Qarəti-din, qəsdi-can etmək dilərsən, etməgil!

Bürqəi tərh eyləmişsən, ey qəmər, üzündən uş,
Fitneyi-axırzaman etmək dilərsən, etməgil!

Xəttü xalın “Məntiqüt-teyri”dir əhli-vəhdətin,
Quş dilin sən tərcüman etmək dilərsən, etməgil!

Çün ənəlhəqdən götürdü surətin mahı niqab,
Sən həqi neçün nihan etmək dilərsən, etməgil!

Surətin gənci-xəfidir, göstərərsən güzgüdə,
Aləmi eyni-əyan etmək dilərsən, etməgil!

Qəmzədən misri qılınc vermişsən əsrük türkə kim,
Qanbəhasız necə qan etmək dilərsən, etməgil!

Kirpigindən canşikar oxları düzmüşsən, məgər
Qaşların yayın kəman etmək dilərsən, etməgil!

Badə vermişsən pərişan zülfünü sən dağıdıb,
Canları bixaniman etmək dilərsən, etməgil!

Latəhərrük ayəti gəldi bəyanın şə’ninə,
Ol bəyanı sən bəyan etmək dilərsən, etməgil!

Ey Nəsimi, həqdən istərsən götürmək pərdəyi,
Bütpərəsti bigüman etmək dilərsən, etməgil!

Firqət içində yanıram, dərdimə eylə çarə gəl,
Yaralu oldu, üştə gör, bağrım içində yarə gəl.

Səbrimi qarət eylədi, qapdı qərarımı qəmin,
Necə cəfayı gör qəmin qıldı bu biqərara gəl.

Qəmdən əgərçi firqətin min çəri çəkdi üstümə,
Sən mana bəssən, ey sənəm, qorxmavü yeksüvarə gəl.

Düşdügüm ayru səndən uş yanar od oldu canıma,
Ey gözümün çırağı, sən yaxma məni bu narə gəl.

Zülfü rüxün vüsalına susamış, ey qəmər, gözüm,
Ey qəmərin qatında yüz ay ilə gün, sitarə gəl.

Möhnət içində qərqəyəm firqətinə ulaşalı,
Çək, sənəma, bu vərtədən zovrəqimi kənarə gəl.

Məndən ayırma vəslini necə ki, şad olur ədu,
Yürəgini ədulərin yaralu eylə, yarə gəl.

Düşmüşəm ahü naləyə səndən olalı ayrı mən,
Görmə rəva bu halımı, qoyma bu rəsmü karə gəl.

Müntəzir oldu vəslinə həsrətü dərdi çox könül,
Xoş degil, anı yandırıb və’dəvü intizarə gəl.

Canım içində gözlərəm mehrini ol saçın kimi,
Şövqi-rüxündən, ey pəri, pərdəsi oldu parə gəl.

Canü təni Nəsiminin sənsənü səndən özgə yox,
Var isə səndən özgə gər, can ilə təndə arə gəl.

Nigarım, dilbərim, yarım, ənisim, munisim, canım,
Rəfiqim, həmdəmim, ömrüm, rəvanım, dərdə dərmanım.

Şəhim, mahım, dilaramım, həyatım, dirligim, ruhim,
Pənahım, məqsədim, meylim, muradım, sərvərim, xanım.

Qəmərçöhrəm, pəriruyim, zərifim, şuxumü şəngim,
Səmənbuyim, güləndamım, səhisərvi-gülüstanım.

Lətifim, nazikim, xubim, həbibim, türfə məzbubim,
Hicazım, Kə'bəvü Turim, behiştim, hurü rizvanım.

Gülüm, reyhanım, əşcarım, əbirim, ənbərim, udum,
Dürüm, mirvaridim, kanım, əqiqim, lə'lü mərcanım.

Diləfruzum, vəfadarım, cigərsuzum, cəfakarım,
Xudavəndim, cahandarım, əmirim, şahü sultanım.

Çırağım, şəm'imü nurim, ziyamü yıldızım, şəmsim,
Həzarım, bülbülüm, kəbkim, Nəsimiyi-xoşəlhanım!

Həbibim, izzətim, canım, cahanım,
Rəfiqim, munisim, arami-canım.

Sənubərqədli dildarım, təbibim,
Yetir didarına ruhi-rəvanım.

Ki, can quşu uçar bir gün qəfəsdən,
Qalır firqət içində mehri-canım.

Fəraqın dərdi çoxdur, deyə bilmən,
Əgər dersəm qalır heyran cavanım.

Qatımdan getməz oldu nari-hicran,
Çəkə bilməm, nedim arami-canım?

Xumari-mehriniz göydürdü canı,
Yetir şərbət vüsalından nəhanım.

Nəsimi çəkdi qəm anəstünarən,
Odu issi nə qılsın natəvanım?

Səndən iraq, ey sənəm, şamü səhər yanaram,
Vəslini arzularam, daxi betər yanaram.

Eşq ilə şövqün odu canıma kar eylədi,
Gör necə tabından, ey şəmsü qəmər, yanaram.

Məndən irağ olduğun bağrımı qan eylədi,
Oldu gözümdən rəvan xuni-cigər, yanaram.

Şəm'i-rüxün surəti qarşıma gəlmişdürür,
Şə'şəəsindən mana şö'lə düşər, yanaram.

Səbr ilə aramımı qapdı əlimdən qəmin,
Badi-həvadan degil, qəmdən əgər yanaram.

Çıxdı içimdən tütün, çərxi boyadı bütün,
Gör ki, nə atəşdəyəm, gör nə qədər yanaram.

Yandığımız yar üçün, gizli degil, mən dəxi
Hər nə qədər kim, anın könlü dilər, yanaram.

Müddəi yanar demiş qəmdə, Nəsimi üçün,
Qəmdə yanan yarı yar çünki sevər, yanaram.

Canıma düşdü firqətin, gör ki, nə nar içindəyəm,
Güldən iraq gül kimi möhnəti-xar içindəyəm.

Canımı vüsləti-ləbin hicrə mübəddəl eylədi,
Gör nə meyü piyalədən rənci-xumar içindəyəm.

Zülfü rüxün şümarını şamü səhərdə sayaram,
Kim bilir ol şümari kim, mən nə şümar içindəyəm?

Lə'lü əqiqü inciyi saçaram altun üstünə,
Gör ki, gözümdən uş necə bəzlü nisar içindəyəm.

Ey qamu xubların şahı, lütfü inayət eyləgil,
Dut əlimi ki, düşmüşəm əqrəbü mar içindəyəm.

Zülfü rüxün hədisini necə unudam, ey pəri,
Çün dünü gün anınla mən leylü nəhar içindəyəm.

Canımı ənbərin saçın seyd edəli kəməndinə,
Rumü Xətayi dutmuşam, Çinü Tatar içindəyəm.

Nəqşi-nigarını üzün məndə müsəvvər eylədi,
Mən bu nigari-nəqş ilə nəqşü nigar içindəyəm.

Fəzli-ilahə canını eylə fəda, Nəsimi, sən
Olma məlul, ayıtma kim, bəndü hasar içindəyəm.

Gərçi fəraqə düşmüşəm, eyni-vüsal içindəyəm,
Gəl nəzər eylə halıma gör ki, nə hal içindəyəm.

Vəsli-rüxün zülalına susadım, üştə yanıram,
Gözümə baxü gör necə abi-zülal içindəyəm.

Nəqşi-xəyali-surətin sanma ki, məndən ayrıdır,
Çün bu xəyalü nəqş ilə nəqşü xəyal içindəyəm.

Xürrəm edər ümid ilə vəsli-rüxün məni, vəli
Vəsl irişincə canıma, hüznü məlal içindəyəm.

Zülf ilə qaşü kirpigin əbcədi-cimü dal imiş,
Mən bu hüruf şəkliçün cim ilə dal içindəyəm.

Talevü bəxt yıldızım kövkəbi-nəhsə uğradı,
Ey şərəfim, səadətim, gəl ki, vəbal içindəyəm.

Vəslinə irmək istərəm gərçi ki, eyniyəm anın,
Məndən anı kim ayıra, fikri-məhal içindəyəm.

Sən mənim olduğun, şəha, düşmənə zahir olmamış,
Münkir ilə bu mə’nidən qiyl ilə qal içindəyəm.

Surətü qaşü alnına verdi Nəsimi könlünü,
Mən bu səbəbdən, ey günəş, bədrü hilal içindəyəm.

Bir cəfakeş aşiqəm, ey yar, səndən dönməzəm,
Xəncər ilə yürəgimi yar, səndən dönməzəm.

Ey sənəm, eşqin yolunda qamətintək doğruyam,
Çəksələr Mənsurləyin bər-dar, səndən dönməzəm.

Müshəfi-hüsnün həqiçün, ey dilaramım mənim,
Anca kim, bu təndə canım var, səndən dönməzəm.

Gər Zəkəryatək məni başdan ayağa yaralar,
Başıma ərrə qoya nəccar, səndən dönməzəm.

Leyliyi-şeyda idim seydinə düşdüm, ey nigar,
Yanaram Məcnun kimi mən zar, səndən dönməzəm.

Rindi-rüsvayəm, başımda vardır sevdayi-eşq,
Namü nəngi qoymuşam, həm ar, səndən dönməzəm.

Hüsnünə mən aşiqəm, ey dilbər, əgər sən mana
Qılasan min gəz cəfa, dildar, səndən dönməzəm.

Kə’bədə istər idim, bütxanədə buldum səni,
Bağladım uş belimə zünnar, səndən dönməzəm.

Möhnətindən, ey pəri, haşa ki, mən üz döndərəm,
Yanaram pərvanətək bər-nar, səndən dönməzəm.

Hər rəqibin gündə min gəz tə’nəsin nuş eylərəm,
Mən Nəsimi, sən pəri, zinhar səndən dönməzəm.

Ta üzün gördüm, nigara, qəmdən azad olmuşam,
Qulluğunda padişahım, hüsnünə şad olmuşam.

Gəlmişəm didarına ta canımı qurban edəm,
Ey dodağı, cani-Şirin, gör nə Fərhad olmuşam.

Ta camalın müshəfindən oxuram səb'ül-məsan,
Səb'əxanam, hafizəm, təfsirdə ustad olmuşam.

Laməkanın eyni-mə'murundan oldun, ey həbib,
Laməkan əsasına gör kim, nə bünyad olmuşam.

Qamətindən ta iraq etdi məni dövri-fələk,
Həsrətindən mən qulami-sərvi-azad olmuşam.

Çün səni gördü Nəsimi der bəavazi-bülənd:
Eşq ilə mən aşinayəm, əql ilə yad olmuşam.

Mişkin saçın hər tarəsin iki cahana verməzəm,
Lə'lin vüsalın bir nəfəs min dadlu cana verməzəm.

Şəhla gözün sevdaları əhdü əmanətdir mana,
Nur-əl-yəqinin sirrini olmaz gümana verməzəm.

Aydır mana, ver, müddəi, yarı bu gün yarın günə,
Bir saat anın vəslini dəhrü zamana verməzəm.

Zülfündə can qıldı vətən, hübbülvətən şərti ilən,
Mən məskənül-ərvahımı kövnü məkana verməzəm.

Nazü nəimi dünyanın bilxatimə gər sud isə,
Külli ziyandır aşiqə, sudu ziyana verməzəm.

Oldu kəlamından yəqin, k'anın dəhanı var imiş,
Eynəl-yəqinin rö'yətin qeybü gümana verməzəm.

Ey bənzədən qəddin anın sərvü çinarü ər'ərə,
Mən sidrəvü tuba adın hər birəvana verməzəm!

Ey inciyi mədh eyləyən, yaqutunu cövhər bilən,
Mən bulduğum dürdanəyi yüz bəhrü kana verməzəm!

Eşqi-məcazi salikə zərqü riyadən yegdürür,
Həq bil bunu kim, kimsəyi sudü ziyana verməzəm.

Yarın dodağı vəsfini, ey zahid, əbsəm, sorma kim,
Nitqin Məsihü Məryəmin hər bizəbana verməzəm.

Çünki Məsihanın dəmi nitqi-Nəsimidir bu gün,
Anı bahasız sanma kim, can rayigana verməzəm.

Ta kim, üzünü görmüşəm, hüsnündə heyran olmuşam,
Düşdüm saçın sevdasına, gör nə pərişan olmuşam.

Gəl gör məni batində kim, nə gizli gəncəm fanisiz,
Zahirdə gör bu surəti, aləmdə viran olmuşam.

Lə'lin Məsiha mö'cüzün aləmdə əhya eylədi,
Uş mən vüsalından anın sər-ta-qədəm can olmuşam.

Həqqin kəlamı məndədir, sanma məni həqdən iraq,
Çünki könüldür ərşi-həq, bəs ərşi-rəhman olmuşam.

Anəstünarın sirrinə Musa kimi irsəm deyən,
Gəlsin məni görsün ki, uş aləmdə dastan olmuşam.

Gənci-nihanın sirriyəm, həm küntə kənzin məzhəri,
Həm cövhərəm, həm cövhəri, həm cövhərə kan olmuşam.

Üştə Nəsimiyəm bu gün kəndi vücudum şəhrinə,
Fəth eylədim həqdən bu gün, xaqanü sultan olmuşam.

Adım Nəsimidir, bu gün oldum kəlami-natiq uş,
Həm ayinə, həm nuri-həq, həm Fəzli-yəzdan olmuşam.

Hüsnün təala şanəhü sün’ində heyran olmuşam,
Şirin ləbini yad edib, sər ta qədəm can olmuşam.

Badi-səbadan sünbülün kim, ayə düşmüş sayəsi,
Aşüftə gördüm, ey sənəm, andan pərişan olmuşam.

Abi-həyatın zövqünü mən ta ki, sordum ləblərin,
Içirmiş ol meydən mana, mən abi-heyvan olmuşam.

Simin əlin dəstan ilə ta könlümü seyd eylədi,
Hər dilə düşmüşdür adım, aləmdə dəstan olmuşam.

Çün əhsəni-təqvim idi, əqlim mana insan dedi,
Ol canların məhbubu gör, bil kim, nə insan olmuşam.

Kə’bə üzündür canıma, eşq ilə məscudam ana,
Ey zülfü kafir, gör necə gerçək müsəlman olmuşam.

Bəndə Nəsimi görəli nuri-xuda üzündə mən
Indi şəhadət əhliyəm, çün əhli-iman olmuşam.

Allahü əkbər, ey sənəm, hüsnündə heyran olmuşam,
Qövsi-qüzehdir qaşların, yayına qurban olmuşam.

Üzündür ol cənnət gülü, boyun həqiqət sərvidir,
Eşqində mən bülbül kimi aləmdə dəstan olmuşam.

Kövnü məkandan keçmişəm, mə'ni şərabın içmişəm,
Canana, üzün görmüşəm, başdan ayaq can olmuşam.

Də'vi mənəm, qazi mənəm, münkir mənəm, razi mənəm,
Dağı mənəm, yazı mənəm, mən külli-dövran olmuşam.

Sufi mənəm, safi mənəm, kafi mənəm, şafi mənəm,
Ərni mənəm, heyran mənəm, dərd ilə dərman olmuşam.

Zahid mənəm, abid mənəm, asi mənəm, fasiq mənəm,
Mö'min mənəm, kafir mənəm, mən külli-insan olmuşam.

Uçmaq ilə rizvan mənəm, damu ilə niran mənəm,
Dana ilə nadan mənəm, həm inü həm an olmuşam.

Gəh çıxmışam Isa kimi, çərx üstünə oturmuşam,
Gəh varmışam Yusif kimi, Misirdə sultan olmuşam.

Sərrafi-bəhri-qüdrətəm, yaquti-kani-vəhdətəm,
Şimdi Nəsimiyəm, bu gün xak ilə yeksan olmuşam.

Gəl, ey dilbər ki, müştaqam, səni görmək dilər könlüm,
Qəmindən düşdü zar, istər vüsalından şəkər könlüm.

Qara qaşın hilalını gözümdən ta bəid etdin,
Dutuşdum narə eşqindən, yanar, zari qılar könlüm.

Səqahüm rəbbühüm gəldi dodağından xəbər cana,
Susamışdır, yenə istər ləbindən çeşmələr könlüm.

Cahanda can ilə könlüm vüsalın ixtiyar etmiş,
Zəhi görmüş həqi canım, zəhi sahibnəzər könlüm!

Nə gövhərsən, əya can kim, cahanın bəhrü kanında
Mükərrəm qədrü qiymətlü səni bildi gühər könlüm.

Qəmin narından, ey dilbər, könül qaynar, içim yanar,
Bu rəncü möhnəti gör kim, qəm ucundan çəkər könlüm.

Səbir qılmaq dəvadır der mühübbün dərdinə naseh,
Vəli naseh dəvasından olur hərdəm betər könlüm.

Gəl, ey lütfü nəhayətsiz, məni vəslindən ayırma
Ki, şol ömrüm ki, vəslinlə keçər, ömrə sayər könlüm.

Vüsalından məni ayru, kərəm qıl, qılma, lütf eylə
Ki, vəslinlə müdam olmaq dilər şamü səhər könlüm.

Gəl ara könlümün için, gör, ey can kim, fəraqından,
Nə acı qüssələr yudar, nə ağular içər könlüm.

Iki aləm mana sənsiz gərəkməz, olmasın hərgiz,
Cahanın hasili sənsən, anı sənsiz nedər könlüm?

Saçın zəncirini məndən fələk çün çəkdi, ayırdı,
Tənim şəhrində sevdadan dəli olmuş, gəzər könlüm.

Xəyalı sevdigim yarın gözümdən gərçi ayrılmaz,
Camalın pərdəsiz görmək dilər açıqbəsər könlüm.

Əzəldə surəti-rəhman üzün şə’nində gördüm çün,
Ilahi surətin daim bu mə’nidən sevər könlüm.

Nəsimi yarını verməz cahanın varına, andan
Keç, ey də’vaçı nadan kim, degildir ol qədər könlüm.

Ey nuri-dilü didə, didarına müştaqəm,
Vey yari-pəsəndidə, didarına müştaqəm.

Ey mahi-pəripeykər, vey huri-mələkmənzər,
Vey lə'li-ləbi şəkkər, didarına müştaqəm.

Ey rəhməti-ilahi, sənsən yerü gög mahı,
Vey qamu xubun şahı, didarına müştaqəm.

Ey şəmsü qəmər üzlü, şirin dodağın duzlu,
Vey şəhdü şəkər sözlü, didarına müştaqəm.

Ey cümlə cahan canı, aşiqlərin imanı,
Vey simü gühər kanı, didarına müştaqəm.

Ey sahibi-təxtü tac, canlar canına möhtac,
Vey görklü üzün me'rac, didarına müştaqəm.

Ey nuri-səmavati, vey məzhəri-ayati,
Vey canü cahan zati, didarına müştaqəm.

Ey eşqi-dürəfşanım, vey bülbüli-bustanım,
Vey nərgisi məstanım, didarına müştaqəm.

Ey buyi-baharıstan, vey huri-nigarıstan,
Vey dilbəri-sərməstan, didarına müştaqəm.

Ey dərdimə sən dərman, tən gövdəvü eşqin can,
Vey tazə güli-xəndan, didarına müştaqəm.

Ey çeşmeyi-heyvanım, sənsiz nedərəm, canım,
Vey şahımü sultanım, didarına müştaqəm.

Ey dilbəri-pünhani, sənsiz nedərəm canı,
Vey Yusifi-Kən’ani, didarına müştaqəm.

Ey hüsnü bidayətsiz, vey lütfü nəhayətsiz,
Vallah ki, bəğayətsiz, didarına müştaqəm.

Ey dilbəri-dildarım, sənsən əbədi yarım,
Vey yari-vəfadarım, didarına müştaqəm.

Ey çeşməyi-heyvanım, sənsiz olımaz canım,
Vey bəhri-gühər kanım, didarına müştaqəm.

Ey dilbəri-simintən, sən canü Nəsimi tən,
Vey sərvü gülü gülşən, didarına müştaqəm.

Üzündə surəti-rəhmanı gördüm,
Qaşında qafu vəl-Qur'anı gördüm.

Oxudum dərsi-hüsnün ayətini,
Yeddi müshəf kimi Fürqanı gördüm.

Məhəmməd ümmətindən sən doğalı,
Səni gözəllərin sultanı gördüm.

Bizim məqsudumuz didarınızdır,
Oxudum dəftəri-divanı gördüm.

Məmat olmaz könül darül-fənada,
Ləbintək çeşmeyi-heyvanı gördüm.

Züleyxatək bu gün dərdə giriftar,
Həzaran Yusifi-Kən'anı gördüm.

Nəsimitək bu gün hər kim verər can,
Yəqindir, gər desə cananı gördüm.

Mişkin saçın səvadına mişki-Xəta derəm,
Mişki-Xəta nə nəsnədir, anı xəta derəm.

Ol həqqi tanıyan ki, üzün Kə'bədir demiş,
Mə'nidə hacı oldurur, əhli-səfa derəm.

Eşqin bəladurur deyənə e'tiqad ilə
Həqdən həmişə başına gəlsin bəla derəm.

Sənsiz mühibbi-sadiqə nazü nəimi-xüld,
Dərdü əzabü möhnətü rəncü əna derəm.

Cami-cahannüma dedilər üzünə, vəli
Həqdən mən anı ayineyi-həqnüma derəm.

Yoxdur vəfası zərrəcə könlümdə dünyanın,
Ol bivəfaya anın üçün bivəfa derəm.

Könlün mənə nə dürlü cəfa kim, dilərsə qıl,
Səndən gələn cəfaya xaçan mən cəfa derəm.

Dərdin dəvasın etməgil, ey münkir, əbsəm ol,
Şol mə'nidən ki, dərdinə yoxdur dəva derəm.

Ey rənci-eşqə düşmə deyən, doğru aşiqə,
Ol rəncə düşməsin ki, ana mən şəfa derəm?

Ol ömrü ki, vüsalın ilə keçmədi müdam,
Keçmiş həvavü hərzəyə, badü həva derəm.

Hər kim irişdi həqqə Nəsimi kimi yəqin
Anı cahanda mən yar ilə aşina derəm.

Dilbəra, mən səndən ayru ömrü canı neylərəm?
Tacü təxtü mülkü malü xanimanı neylərəm?

Istərəm vəsli-camalın ta qılam dərdə dəva,
Mən sənin bimarınam, özgə dəvanı neylərəm?

Ey müsəlmanlar, bilin kim, yar ilə xoşdur cahan,
Çünki yardan ayru düşdüm, bu cahanı neylərəm?

Çox dualar qılmışam mən xaliqin dərgahına,
Çün muradım hasil olmaz, mən duanı neylərəm?

Dilbər aydır, ey Nəsimi, sabir ol, qılma fəğan,
Mən bu gün səbr eyləsəm, danla fəğanı neylərəm?

Mənim rəhbanımü deyrim, səlibim, dinim, imanım,
Həbibim, rahətim, ruhim, rəfiqim, munisim, canım.

Nurumsan, zülmətim, narım, şəbimsən, rövşənim, şəm'im,
Münəvvər nurumü hurim, nəimü xüldü rizvanım.

Təbibim, şərbətim, dürdüm, nabatım, şəkkərim, qəndim,
Əlacım, mərhəmim, çarəm, Calunis ilə Loğmanım.

Bənbövşəm, sünbülüm, vərdim, rəyahin, zanbağım, laləm,
Əbirim, ənbərim, udum, gülüm, qönçəm, gülüstanım.

Kitabım, müshəfim, dərsim, hədisim, əbcədim, lövhüm,
Səlatım, taətim, zöhdüm, savabım, həccü ərkanım.

Rəmimü gorumü cismim, dü eynim, fikrimü əqlim,
Amanım, adətim, fitnəm, təbiət ünsürü qanım.

Nəsimi çün səni buldu, kəsildi cümlə varından,
Hamudan sevgilim sənsən, mənim sərvi-xuramanım.

Ey gülüm, eü sünbülüm, ey susənim, vey ənbərim,
Ey mənim nüqlüm, meyim, həbbim, nabatım, şəkkərim.

Ey həbibim, ey təbibim, ey bütüm, ey həmdəmim,
Ey rəfiqim, ey şəfiqim, ey ənisim, dilbərim.

Ey baharım, ey nigarım, ey şikarım, şahidim,
Ey hərifim, ey zərifim, ey şərifim, sərvərim.

Ey gülüstanım, gülüm, sərvi-güləndamım mənim,
Sağərim, şəm'im, şəbistanım, məlayikmənzərim.

Ey riyahin rahətim, ruhi-rəvanım, lütf ilə,
Sərfərazim, sərkəşim, şuxü səadət əxtərim.

Ey mənim xurşidü mahım, ey çırağım, fanusum,
Şux çeşmim, lütfi-şahım, ey mübarək peykərim.

Eşqin aldı əqlü huşum, könlümü yəğmaladı,
Söylə axər, ey Nəsimi, cani-dildən çakərim.

Üzündür məqsədim, qibləm, ləbindir abi-heyvanım,
Əya, sərvi-sərəfrazım, fəda olsun sana canım.

Ki, sənsən dərdimə dərman, üzün Fürqan, xətin reyhan,
Fəda olsun sana min can ki, sənsən şahü sultanım!

Ənisim, rəhbərim, yarım, gülər üzlü güləndamım,
Əbirim, ənbərü mişkim, boyu sərvi-xuramanım.

Əzizim, sərvərim, ömrüm, hədisim, təfsirim, elmim,
Çü lə’lü yaqutum, dürrüm, şikarım, gövhərim, kanım.

Kəlamım, zikri-Qur’anım, kitabım, fikri-tövhidim,
Namazım, razımü səcdəm, bəkülli cümlə ərkanım.

Fazilim, kamilim, meylim, muradım, məqsədim, könlüm,
Cavabım, məsələm, sözüm, dilimdə cümlə dəstanım.

Həyatım, rahətim, mehrim, nicatım, ülfətim, zatım,
Təbibim, şərbətim, Xızrım, vücudum, sihhətim, canım.

Əzəldəndir mənim dərdim, sözü gerçək, qəmər bədrim,
Mühibbim, sevdiyim, mehrim, siyah zülfü pərişanım.

Təriqim, gəncimü malım, Nəsimim, aşiqim, eşqim,
Həbibim, vey əzizim, ey əzəldə kamil insanım.

Könlümün viranəsində gənci-pünhan bulmuşam,
Olmuşam şol maha qurban, yüz dilü can bulmuşam.

Eşq dərdindən qaçan könlüm usana, çünki mən
Dilbərin dərdində hər dəm bunca dərman bulmuşam.

Küfr əgər iman deyilsə pəs niçün düşmüş ki, mən
Küfri-zülfün həlqəsində nuri-iman bulmuşam?

Xızr əgər zülmata vardı, istədi abi-həyat,
Mən dodağın çeşməsində abi-heyvan bulmuşam.

Dişlərin əksi, nigara, könlümə nəqş olalı,
Gözlərim bəhrində hər dəm dürrü mərcan bulmuşam.

Rövzeyi-rizvanə də'vət qılma, ey zahid, məni,
Çün mən ol dərgahdan səhni-gülüstan bulmuşam.

Ey Nəsimi, canımı şol qaşa qurban eylədim,
Gör nə gögçək şol hilali-yayə qurban bulmuşam.

Üzün günündən, ey qəmər, ənvara düşmüşəm,
Anəstünarən olmuşam, ol nara düşmüşəm.

Darüs-səlami-hüsnünə, ey cənnətin gülü,
Düşdüm əzəldə, gör ki, nə gülzara düşmüşəm.

Düşdüm xəyali-zülfünə, ey müttəqi, məni
Təsbihə də'vət etmə ki, zünnara düşmüşəm.

Fikrimdədir xəyalı gözünlə ləbin müdam,
Yərəb, nə rəsmə xəmrəvü xummara düşmüşəm?

Canü cahanı vəslü camalın bahasına
Verdim əzəldə, gör ki, nə bazara düşmüşəm.

Şeytandır ol ki, surətinə qılmadı sücud,
Şeytana münkir olmuşam, inkara düşmüşəm.

Ey vəhdətin meyindən uşalan xumarına,
Məsti-ələstə sor ki, nə meyxarə düşmüşəm.

Faş eylədim cahanda ənəlhəq rümuzunu,
Doğru xəbərdir, anın üçün dara düşmüşəm.

Kən'ani Yusifin ləbi-şirini buldum uş,
Fikr eylə kim, nə züngi-şəkərbara düşmüşəm.

Eşqin qədimü zülfü rüxün daimüləbəd,
Yarəb, nə incə işü uzun kara düşmüşəm.

Ey sübhdəm yeli, nə ögərsən tatarını,
Mişkin saçında gör ki, nə tatara düşmüşəm.

Hüsnün hürufunu mana verdi səbəq rüxün,
Dərsim bu əbcəd olduvü təkrara düşmüşəm.

Gördü Nəsimi mə'şuqunun üzünü bu gün,
Həqqi bilən bilir ki, nə dildara düşmüşəm.

Ey həbibim, dilbərim, vey sevgili yarım mənim,
Vey dilaramım, nigarım, bəxti-bidarım mənim.

Ey güləndamım, gülüm, vey bülbülüm gülzar ilən,
Işrətim, eyşim, tərəbim, türfə əyyarım mənim.

Rahətim, ruhum, rəvanım, can içində sənmisən,
Qüvvətim, püştüm, pənahım, sirrü əsrarım mənim.

Yusifim, Misrim, Əzizim, dövlətim, başım tacı,
Şəkkərü qəndü nabatım, türkü tatarım mənim.

Səbrim, aramım, qərarım, qiymətim, qədrim bilən
Fikrim, əndişəm, xəyalım, varlığım, varım mənim.

Nazikim, xubum, lətifim, mehribanım, tazə gül,
Munisim, canım, rəfiqim, şol vəfadarım mənim.

Sərvərim, şahım, əminimsən, humayun kölgəlim,
Həm yenə səndən düzülmüş uşbu bazarım mənim.

Cənnətim, hurim, nəimim, kövsəri-mai müin,
Görk içində gündən ayrı hüsnü dildarım mənim.

Kə’bəmü qibləm, sücudum qaşların mehrabıdır
Üzümü döndərməzəm gər, asalar, darım mənim.

Seyyidin razü niyazı, məhrəmi sənsən bu gün,
Həm sana gəlmiş əzəldən sidqü iqrarım mənim.

Canımı yandırdı şövqün, ey nigarım, qandasan?
Gözlərim nuru, iki aləmdə varım, qandasan?

Bağrımı qan eylədi acı fəraqın, gəl iriş,
Ey ləbi vüslət şərabi-xoşgüvarım, qandasan?

Firqətin xarı məni gör kim, nə məcruh eylədi,
Ey gözü nərgis, həbibi-gülüzarım, qandasan?

Səbrimi yəğmaladı şövqün, qərarım qalmadı,
Ey mənim aramım, ey səbrü qərarım, qandasan?

Eylədi eşqin məni qalxan məlamət tirinə,
Ey gözü, qaşı yeləkli şəhriyarım, qandasan?

Ta üzün şəm’indən iraq düşmüşəm, pərvanətək
Yanaram leylü nəhar, ey nurü narım, qandasan?

Səndən ayru könlümün yoxdur vəfalı yarü dust,
Ey cəfasız hüsni-kamil, yariğarım, qandasan?

Dəldi hicranın oxu eşqində yanan bağrımı,
Surətü mə’nidə, ey çapüksüvarım, qandasan?

Zülfünə vermiş əmanət həq əzəldə sirrini,
Ey əmanətdar, əmini-kirdigarım, qandasan?

Qatı müştaq olmuşam zülfü üzarın buyinə,
Ey üzü gülşən, saçı mişki-tatarım, qandasan?

Badilən göndər saçın buyin mana hər sübhdəm,
Ta ki yandım, keçdi həddən intizarım, qandasan?

Aşiqin cənnati-ədni şol camalın vəslidir,
Ey şərabi-kövsərim, getməz xumarım, qandasan?

Yar üçün hər guşədə min div olur düşmən mana,
Ey səvadi-ə'zəmü möhkəm həsarım, qandasan?

Çün Nəsimidir bu gün əyyami-eşqin xosrovu,
Ey şəkərləb, yari-şirinruzigarım, qandasan?

Yandırdı şövqün canımı, ey dərdə dərman, qandasan?
Canımda can sənsən, vəli, istər səni can, qandasan?

Vəslin şərabından məni saldı xumarın rəncinə,
Yandı hərarətdən içim, ey abi-heyvan, qandasan?

Ey lütfi-hüsnün kişvəri, yandım, irişdir vəslinə,
Çün səndən artıq kimsədə yoxdur bu ehsan, qandasan?

Qapdı əlimdən zülfünü cövrü cəfası çox fələk,
Aşüftəyəm, Məcnun kimi zarü pərişan, qandasan?

Rə’na boyun şövqündən uş həsrətdə yanar gözlərim,
Qan ağlaşırlar sənsizin sərvi-xuraman, qandasan?

Ey qönçə ağızlı, məni yandırdı hicrin tikəni,
Gəlgil ki, sənsiz qönçətək doldu içim qan, qandasan?

Eynimdə sənsən rövşəni, könlüm dilər görmək səni,
Ey hurieyn Rizvan ilə hüsnündə heyran, qandasan?

Cövri-cəfası çox fələk tufan gətirdi başıma,
Andan məni qurtarmağa, ey Fəzli-rəhman, qandasan?

Mişkin saçın zəncirinə verdi Nəsimi könlünü,
Ayrux nə hacətdir ana zəncirü zindan, qandasan?

Hilalə döndü qəmər qaşların hilalından,
Boyandı qana qızılgül yanağın alından.

Çələb səni necə şirin dodaqlı yaratmış
Ki, səlsəbil utanır ləblərin zülalından.

Ayın hilalı əgərçi günəşdən alır nur,
Bü ayı gör ki, günəş nur alır hilalından.

Qara bənin nə əcəb türfə hala düşmüşdür,
Bu halı bilməyənin hiç sorma halından.

Təvildir saçının qissəsivü sirri dəqiq,
Əgər inanmaz isən sor bu nüktə xalından.

Nə hüsn olur bu, nə surət, əleykə eynüllah
Ki, məst olur görəcək əql anın kamalından.

Cəfada yana-yana gör ki, mən nələr çəkirəm,
Bu eyni fitnəli yarın cəfalı dalından.

Cəfaları nə qədər acı isə, yeyrəkdir
Anın acısı rəqibin yağilə balından.

Çələb Nəsimiyə çün əskik eyləməz bir şal,
Nə ətləsindən umar kimsənin, nə şalından.

Ey üzün cənnati-ədnin, vey boyun tubi-rəvan,
Fədxəluha xalidun ondan bilindi cavidan.

Zahir oldu surətindən mə'niyi-ümmül-kitab,
Andan izhar oldu həqdən bunca ayatü bəyan.

Qaf vəl-Qur'an yanağından bilindi gör bu gün,
Yeddi xət, səb'ülməsani oldu üzündən nişan.

Surətindən zahir oldu mə'niyi-zatül-əhəd,
Əlləməl-əsmavü tahadır üzün nuri-düxan.

Həq təala çün təcəlli eylədi Tur üstünə,
Musiyi-Imran dəlilidir yəqin, hüsnün nişan.

Saəti-leylü nəharın gör, bəyan həqqindədir,
Bildim anı həq bilir, sənsən yəqin canü cahan.

Cümlə əşya zövc imiş həqdən çü yekta layəmut,
Istiva ərş üstünə zahir sirat oldu əyan.

Zahir oldu surətin həq uş kəlamüllahı gör,
Ta bəyani-nəhnü vəqrəb biləsən, ey zində can.

Natiq oldu cümlə əşya Fəzli-həqdən aşikar,
Rəbbəna, ətməm ləna nurən təali filcinan.

Çün Nəsimi zülfü xalından oxur ümmül-kitab,
Kaşifi-əsrar olubdur ol zi Fəzli-müstəan.

Qibleyi-iman göründü sən büti-əyyarədən,
Afərin olsun, səni nə xoş yaratmış yarədən?

Qanğı bürcün yıldızısan, ey mələk, bilsəm səni,
Mənzilin rəf’ oldu yüz min kövkəbi-səyyarədən.

Başıma çıxdı xumarı layəzali xəmrin uş,
Vəhdətin peymanəsin çün içmişəm xümmarədən.

Çün bəyaz ilə səvadın vahid oldu illəti,
Laşərik olmaq dilərsən, keç bu ağü qarədən.

Yarəb, ol qəmzən oxun min yerdən artıq yemişəm,
Aşiq oldur ki, qayıtmaya yedigi yarədən.

Yanağın şəm’inə hüsnü Yusifin pərvanədir,
Çox könüllər yəğmalandı sən üzü mehparədən.

Işvəsindən fitnələr xətm oldu şəhla gözlərin,
Kimsənə hərfin oxumaz ayruq ol məkkarədən.

Şəm’inə çün yanmadı pərvanətək zahid sənin,
Qoy anı, bağrı qatıdır çünki səngi-xarədən.

Sufiyi-pəşminəpuşun batini safi degil,
Ol qaçan qurtarəsərdir nəfsini əmmarədən?

Vaqtına var, vaiza, qoyğıl məni öz halıma,
Çarəni sən sana et, keç çarəsiz biçarədən.

Eşq mişkin zülfünün bağladı məni bəndinə,
Hərzədir yel kimi gəzmək, nə bitər avarədən?

Çərx qaçan çarparə çaldı, mən ana çərx urmadım,
Əlimə çarparə aldım, dönməzəm çarparədən.

Rühi-qüds oldu Nəsiminin həqiqət sözləri,
Varlığın tərh etdi çünkim, kəndi çıxdı arədən.

Nuri-hikmət zahir oldu sən pəri-rüxsarədən,
Şö’lə düşdü aləmə şol peykəri-məhparədən.

Çün səba seyr etdi, ey dilbər, üzün gülzarına,
Ənbəri-sara töküldü türreyi-tərrarədən.

Vəlvələ düşdü cahana, zöhdü təqva əhlinə
Fitneyi-dövri-qəmər ol nərgizi-əyyarədən.

Şəmsi-tabandır camalın, zahid idrak eyləməz,
Dideyi-xəffaşa nisbət gözləri nəzzarədən.

Sə’di-əkbərdir camalın, vəslə vasil can quşu,
Təl’ əti-fərxəndə şəmsü kövkəbü səyyarədən.

Çün Nəsimi abi-heyvan Xızri-zində istədi,
Sən dəxi nuş eyləgil şol lə’li-şəkkərparədən.

Səba hərdəm gəlir mişkin saçın çinü tatarından,
Cahanı ənbərin eylər nəsimi-mişkbarından.

Nə günəşdir üzün, yarəb kim, anın uca Turundan
Təcəlli gəldi yandırdı Kəlimin şəm'i-narından.

Əgər nuru əla nurən degilsə zülfü rüxsarın,
Nə mə'nidən günəş doğmuş saçın hər tirə tarından.

Mühit oldu vüsalın çün sərasər yabisü rətbə,
Kimin əqli xəbər versin bu dəryanın kənarından.

Nə kişvərdir saçın çini mübarək mənzili-tale
Ki, şəmsi-ləmyəzəl doğmuş anun fərrüx diyarından.

Irəm gülzarı, ey huri, bu mə'nidən üzündir kim,
Səkiz cənnət əyan oldu üzün baği-baharından.

Iki aləmdə məqsudum vüsalına irişməkdir
Ki, vəslindir bu dərvişin muradı şəhriyarından.

Saçınla könlümün əhdi vəfa oldu vəfa, çünkim,
Vəfa buyi gəlir daim saçın əhdi-qərarından.

Ənəlhəqdir münacatım, həq oldu bitdi hacatım,
Gəl, ey Mənsur olan, qurtar bu darın girüdarından.

Qulağı arifin ta kim, Nəsiminin sözün dinlər,
Sədəftək incilər ağzı dolar dür şahivarından.

Ey yanağından xəcil gül laleyi-həmra ilən,
Qanımı tökdü gözün, hər ləhzə bir sevda ilən.

Könlümü al ilən aldı, şimdi can istər gözün,
Bunca şıltağı nədəndir aşiqi-şeyda ilən?

Dişlərin əksi düşəli gözlərim sevdasına,
Lə'l düşmüşdür gözümdən lö'löi-lala ilən.

Ta əbəd sevdaya verdi can ilə dünyavü din,
Hər ki, bazar eylədi şol nərgisi-şəhla ilən.

Ənbəri- zülfün nəsimi faş olalı aləmə,
Oda düşdü nafeyi-Çin, ənbəri-sara ilən.

Çeşmeyi-heyvan suyundan olmadı canı diri
Hər ki, vüslət bulmadı şol lə'li-ruhəfza ilən.

Sərv ilə şümşadü tuba olmasun şimdən gerü,
Çün Nəsimi qane oldu şol qədi-bala ilən.

Sən mana, dilbər, yetərsən, özgələr yar olmasın,
Bir olur yar iki olmaz, iki zinhar olmasın.

Bağrımı doğrar fəraqın xarı, ey cənnət gülü,
Növbahar olsun, gül olsun, arada xar olmasın.

Doğrudur yarın yolu, doğru qayırma yarədən,
Kim ki, doğru yol verər, anın yeri dar olmasın.

Ey səkiz cənnati-ədnin bağü bostanı üzün,
Güldən anın gülşəni bibərgü bibar olmasın!

Kim ki, didarından özgə nəsnə istər, ya dilər,
Yetməsin həqdən nəsibi, əhli-didar olmasın!

Firqətin dərdi məni bixabü giryan eylədi,
Düşmənin ömrü tükənsin, bəxti bidar olmasın!

Tutmuşam eşqinlə peyman, qılmışam hüsnünlə əhd,
Andan özgə əhdü peyman, qövlü iqrar olmasın.

Zülfünün dərdində, şaha, asılan Mənsur idi,
Hər ki, Mənsur olmadı, zülfündə bər-dar olmasın.

Imdi ki, eynindən ayru kimsə xoş bimar ikən,
Yarəb, ol nərgisdən özgə kimsə bimar olmasın.

Ey Nəsimi, qılma yarın sirrini əğyara faş
Ta ki, yar olsun bu sirrə məhrəm, əğyar olmasın.

Gəl ey dilbər ki, qan oldu könül eşqin bəlasından,
Kərəm qıl, vəsl ilə qurtar məni hicran cəfasından.

Təalallah, nə dilbərsən bu hüsn ilə, bu lütf ilə
Ki, didarın necə görsəm gözüm doymaz liqasından.

Məni eşq oduna atan könüldür, ey nigara kim,
Yanar bağrım, axar yaşım gözümün macərasından.

Bu könlüm dərdinə, yarəb, nə dərman eyləyim çünkim,
Qatı heyrandurur hər dəm təbib anın dəvasından.

Ləbi-lə'lin fəraqından, mənim halımı sor andan,
Nəzər qıl üzümə gör kim, əyandır kəhrübasından.

Mənə sürmə kimi gözdə ayağın tozu yaraşır
Ki, yegrəkdir anın tozu həkimin tutiyasından.

Saçın sinində Çin mişki necə üzünü örtmüşdür,
Göröndə ənbərin xəttin qələm çəkmiş xətasından.

Cəfadan hər nə kim könlüm rizasıdır, şəha, eylə
Ki, aşiq cövrilə dönməz dilaramın cəfasından.

Nəsiminin tənin şol gün ki, torpaq eyləyə eşqin,
Sinindən keç, niyaz eşit həzaran mərhəbasından.

Şikayət eyləmənəm dilbərin cəfasından,
K'onun cəfası mana yegdürür vəfasından.

Əzəldə canımı eşqin yolunda çün qomuşam,
Bəlasını çəkərəm, dönməzəm bəlasından.

Nə dərd imiş əcəb, ey könlümü alan, eşqin
Ki, aciz eylədi xəlqi anın dəvasından.

Qəmindən, ey sənəm, oldu könül qatı sayru,
Qanı ana şəkərin şərbəti-şəfasından.

Bəhanəsiz sana çün olmuşam qul, ey dilbər,
Bu bəndəyi, kərəm et, satma, keç bəhasından.

Münəvvər eylə vüsalınla, ey qəmər, gözümü
Ki, firqətin anı acıtdı tutiyasından.

Qara bənin kimi düşdüm od üstünə, yanaram,
Bu atəşi ana sor ki, yanar havasından.

Kimin ki, könlü dolaşdı saçınla qaluda,
Ayırmaz anı saçın zülfi-dilrübasından.

Nəsiminin sininə gəl, qəmindən öləcəgin,
Xoşamədi eşit, ey dost, mərhəba – sindən.

Nigara, küntə kənizin gövhərisən
Ələlərş-istivanın məzhərisən.

Həyati-cavidan bulduq ləbindən,
Məgər cənnati-ədnin kövsərisən.

Iki aləm camalın aşiqidir,
Məgər sən kainatın dilbərisən?

Sana dəyməz mətai-vəsli-məhbub,
Sən, ey sufi, səfasız müştərisən.

Müdam olsun sana vəsli-dilaram
Ki, sən dilbər yolunda sərsərisən.

Səkiz cənnət üzündən zahir oldu,
Məgər sən əhli-ürfan rəhbərisən.

Nəsimidir bu gün sərrafi-mə’ni,
Özünü bil ki, ziba cövhərisən.

Gəl, ey könlümdə can, canda bədənsən,
Nə candasan, əcəb kim, canü tənsən.

Səni dil necə şərh etsin, a can, kim,
Nə bilsinlər səni kim, can, nədənsən?

Üzün çün qul-hüvəllahü əhəddir,
Həqiqət mö’cüzü, həqdən gələnsən.

Vücudun zati-mütləqdir məgər kim,
Nəyə kim, baxar isəm anda sənsən.

Nə yerdənsən, səni heç kimsə bilməz,
Məgər cənnət təki hübbülvətənsən?

Ələl-ərş istivadan dəm urursan,
Bu mə’nidən ki, səndən oldu, sənsən.

Nəsimi çünki buldu xoş məlahət,
Şirindir hər sözü, şirindəhənsən.

Allah-Allah, nə can, nə dilbərsən?!
Allah-Allah, nə bəhri-gövhərsən?!

Yerü gög rövşən oldu üzündən,
Ey uca ay, nə şəmsi-xavərsən?!

Səlsəbil əsrimiş dodağından,
Əcəb, ey can, nə abi-kövsərsən?!

Müşkü ənbər saçından utandı,
Canfəza müşk, tazə ənbərsən!

Surətin hüsn içində vahiddir,
Sən bu tövhid üçün müqərrərsən!

Günəş eylər üzün qatında sücud,
Şol səbəbdən kim, andan ənvərsən!

Günü ayı gətirdi çərxə rüxun
Ey oyunçu qəmər, xoş oynərsən!

Qamətindən qiyamət oldu zühur,
Ey hesabın günü, nə məhşərsən?!

Naim oldu səninlə ləmyəzəli,
Kim ki bildi ki, sən nə cövhərsən!

Ey siyam əhlinə üzün ulu eyd,
Ərşi-rəhmanü eydi-əkbərsən!

Müshəfin ayəti otuz ikidir,
Cavidannamə, sən nə dəftərsən?!

Şəkərin dadını gedirdi ləbin,
Allah-Allah, nə dadlu şəkkərsən?!

Ey Nəsimi, cahanı tutdu sözün,
Övnəkəllah ki, şahi-kişvərsən!

Səndən məni kimdir ayıran, sən
Zahirdə vü batinimdə sənsən.

Həq vahidi-la-şərikü ləhdir,
Sənlik aradan götür ki, mənsən.

Ey aşiqi-sadiq, eylə bil ki,
Mə’şuqə rəvanü sən bədənsən.

Çün zahirü batin oldu vahid,
Həm cövhəri-canü eyni-tənsən.

Bil gövhərinivü cövhəri ol,
Gər nə həcəri-gühərşikənsən.

Yarın ətəyin qaçırdın əldən,
Düşdün bu cəzayə gör nədən sən?

Fərhad ilə Xosrova, Nəsimi,
Şirin gəlici şəkərdəhənsən.

Şol pəridən vəsl umarsan, ey könül, divanəsən.
Şəm’ə yaxılmaq dilərsən, nə əcəb pərvanəsən.

Küntə kənzin gövhərindən xərc edərsən arifə,
Ey bu gəncin nəqdi, hey-hey büləcəb viranəsən.

Zülf çövkan yar ilə düşməz nihan eşq oynamaq,
Başını top eyləgil, meydana gir mərdanə sən.

Gər Xəlil olmaq dilərsən yar ilə gerçəkləyin,
Dilbərin yolunda şərt əvvəl budur kim, yanəsən.

Aşinayı bilməmiş sən, ey bilişdən yad olan,
Mə’rifətdən dəm urarsan, neyləyim biganəsən.

Canların cananı sənsən, ey cahanın sərvəri,
Doğrusu pakizə cövhər, nazənin cananəsən.

Qəmzəsindən fitnələr durdu, oyandı uyxudan,
Sən bu uyxudan qaçan, ey bixəbər, oyanəsən?

Ey Süleyman məntiqindən quş dilin ögrənməyən,
Divə uymuşsan, anunçün tabeyi-əfsanəsən.

Gəl ənəlhəq sirrini meyxanəvü meydən eşit,
Ey düşən inkarə, niçün münkiri-meyxanəsən?

Ey Nəsimi, şol xumari gözləri fəttan kimi,
Daim əsrüksən, məgər kim, nərgisi-məstanəsən?

Külli məkanın gövhəri, gövhəri-kanmısan, nəsən?
Uşbu süfati-hüsnilə cani-cahanmısan, nəsən?

Ərşilə fərşü kafü nun səndədir, ey mələk, bu gün,
Kimsə bu sirrə irmədi, şərhü bəyanmısan, nəsən?

Kövnü məkana baxmazam, çün səni buldum, ey sənəm,
Iki cahan içində sən kövnü məkanmısan, nəsən?

Musa kimi didarını gördü əzəldə gözlərim,
Yaxma məni bu narə gəl, şəm'i-zəbanmısan, nəsən?

Dəhri-zaman içində heç bulmadı kimsə bir dəxi
Sənciləyin, bu lütf ilə dəhri-zamanmısan, nəsən?

Səndə bulundu, gövhərin mə'dəni sənsən, ey sənəm,
Uşbu cahan içində sən gənci-nihanmısan, nəsən?

Qaşların ilə kirpigin qəsd edər üştə canıma,
Bağrımı dəldi navəkin, tirü kamanmısan, nəsən?

Boyunu tubaya sənin nisbət edən nə dil ola,
Uşbu qərar ilə əcəb, sərvi-rəvanmısan, nəsən?

Düşdü Nəsimi eşqinə, sayruvü xəstə neyləsin,
Kəndi həyatı kəndidən cismi-rəvanmısan, nəsən?

Ey könül, şad ol kim, ol məhbubi-zibadır gələn,
Mehr ilə can verdigin mahi-dilaradır gələn.

Doldu könlüm Kə'bəsi nuri-səfa ilə, yəqin
Hüsnü Yusif, xülqü Əhməd, nitqi Isadır gələn.

Necə getməsin başımdan əql, könlümdən qərar,
Gözləri nərgis, ləbi lə'li-müsəffadır gələn.

Ellər uyur gecələr, mən sübhədək ah eylərəm,
Həmdülillah kim, bu gün şol mahsimadır gələn.

Gül yanağın üzrə o səb'ülməsani zülfdən,
Bilməzəm başıma ol dəmdən nə sevdadır gələn.

Der Nəsimini görənlər yollarına payimal:
Yenə ol şuridəvü sərməstü şeydadır gələn?

Dünya çün mürdardır, igrən könül, mürdardan!
Gül degil dünya, tikandir, nə umarsan xardan?

Dünyada bir yar vəfalı kimsənə görmüş degil,
Fariğ ol barı, nə hasil şol vəfasız yardan?

Axirət darından istə hər nə məqsudun ki, var,
Dünyanın miqdarı yoxdur, keç bu bimiqdardan!

Müddəi cövrü cəfasın həddən aşırdı, vəli
Yar əgər yari qılarsa, qəm degil, əğyardan.

Çün Nəsimi zahidin halını bildi kim, nədir,
Meydən ikrah eyləməz, qafil degil xummardan.

Qanı ol günlər ki, keçdi dilbəri-əyyar ilən,
Dilbəri-kafirnəhadü gözləri xunxar ilən?

Lövhəşəllah şol zaman yarım çıxa bimüddəi,
Hər zaman könlümü ala şəkkərin göftar ilən.

Ta məni təqdiri-yəzdan eylədi səndən cüda,
Didə giryan, sinə büryan, mən bu ahü zar ilən.

Barı həqqa, bir dəxi göstər mənə didarını,
Yoxsa kafir oluban bel bağlaram zünnar ilən.

Yar yolunda gər ölürsəm, həq bilir, qayıtmazam,
Qorxuram məndən dönübən yar ola əğyar ilən.

Ey pəripeykər, sənin eşqin mana olsun haram,
Gər dəxi söhbət dutarsam sənsizin dəyyar ilən.

Ey Nəsimi, sən fələkin gərdişindən qəm yemə,
Şadlıq ənduhiləndir, həm qızılgül xar ilən.

Düşmüşəm biyar, ilahi, kimsə biyar olmasın!
Kimsənin halı bu rəsmə müşküli-zar olmasın!

Cənnətin nazü nəimi dilbərin didarıdır,
Hurü rizvanı mana bivəsli-dildar olmasın!

Tamu odundan acıdır nari-hicrin aşiqə,
Kimsənin canında səndən, yarəb, ol nar olmasın!

Hər kimin məqsudu səndən qeyri didar olmadı,
Ta əbəd həqdən nəsibi qeyri didar olmasın!

Aşiqin bağı, gülü, gülzarı yarın üzüdür,
Varikən yarın cəmalı, özgə gülzar olmasın!

Olmuşam şol çeşmi-bimarın fəraqından səqim,
Kimsə şol bimara məndən özgə bimar olmasın!

Aşiqin mişki-tatarı zülfi-yarın buyidir,
Oda yansın nafeyi-Çin mişki-tatar olmasın!

Kim ki, bazar etmədi zülfündə yüz min can ilə,
Ta əbəd vəslinlə anın hiç bazar olmasın!

Kəşfi-əsrarından anın yanaram, səbr eylərəm,
Deməzəm əğyara ta kim, kəşfi-əsrar olmasın!

Bağrımı yandırdı hicrin xarı, ey cənnət gülü,
Bülbülün bağrında güldən hərgiz ol xar olmasın!

Kim ki, bidar olmadı eşqində hər şəb ta səhər,
Ol yalançı müddəinin bəxti bidar olmasın!

Canfəza lə'lin meyindən firqət ayırdı məni,
Yarəb, ol pakizə meydən kimsə huşyar olmasın!

Tutmuşam mehrində peyman, qılmışam hüsnündə əhd,
Mehri-eşqin ləmyəzəl biəhdü iqrar olmasın!

Ey Nəsimi, kim ki, saf olmaz zəri-xalis kimi,
Dilbərin eşqində safi həmçü dinar olmasın!

Şəha, könlün həmişə biqəm olsun,
Əlində daima cami-Cəm olsun.

Gülü lalə camalından xəcildir,
Yüzün yazı həmişə xürrəm olsun.

Sana eyşü nişatü kamirani,
Həsudun dərdi çox, ömrü kəm olsun.

Dəfü çəngü ciğanə, nayü tənbur
Düzülsün daima zilü bəm olsun.

Səni sevənlərə eyşü tamaşa,
Səni sevməyən qəm həmdəm olsun.

Məni gər cövri-hüsnün öldürürsə,
Sənin ömrün tənabı möhkəm olsun.

Rəqib məndən sorar: nəndir sənin yar?
– Əzizimdir, ümidimdir, nəm olsun?

Gətir ol badəni, çün həmdəm olduq,
Içəlim ta kim, ol sübhi-dəm olsun.

Nəsimi xəstədil hicrindən öldü,
Qoy ol biçarəni ta məhrəm olsun.

Alinə vermişəm könül, ali çox alə düşməsin,
Yanağının qızılgülü üstünə jalə düşməsin.

Zülfü uzun qəsidədir, kimsə irəməz ucuna,
Fikri xəta, dili qısa qiyl ilə qalə düşməsin.

Kirpiginin əsiriyəm şol ala gözlü fitnənin,
Kimsə anın xəyalının alına alə düşməsin.

Saçı qarasının qəmin ol nə bilir ki, çəkmədi,
Sir bilənə yetər bu söz, anca sualə düşməsin.

Münkirin əgri gözləri üzünə baxmasın anın,
Kəmnəzərin yavuz gözü hüsni-cəmalə düşməsin.

Eşqilə çünki gəlmişəm aləmə, qoymazam anı,
Tərkini ur deyən mana cürmü vəbalə düşməsin.

Xəlvəti-ərbəin ilə kimsə irişmədi həqə,
Zöhdü səlahə meyl edən fikri-məhalə düşməsin.

Hüsndə həqq anın kimi bir dəxi can yaratmadı,
Huriyə bənzədən anı vəhmü xəyalə düşməsin.

Düşdü kəməndi-zülfünə könlü Nəsiminin, necə
Canı bu rəsmə yanmasın? Kimsə bu halə düşməsin!

Kim dilərsə görməyə təhqiq rəhman surətin,
Gəlsin ol görsün yəqin canan ilə can surətin.

Münkir olma bu sözə, varub kəlamüllahda gör,
Əhsəni-təqvim ilə göstərdi rəhman surətin.

Mən-ərəfna hökmilə öz nəfsini gər bilməsən,
Həq bilir səndən ayırmaz kimsə heyvan surətin.

Küntə kənz əsrarı məxfi qalmasın deyib fəqih,
Verdi uş adəm libasında sana can surətin.

Ta ki, əmrullah qılıncı boynuna düşmək üçün,
Zahidi gör kim, örünmüşdür müsəlman surətin.

Daima çünki Nəsimi həq görür lareybə fih,
Dilbəri üzündə, billah, gördü rəhman surətin.

Surətin nəqşini yazdı, dedi rəbbül-aləmin:
Hazihi cənnati ədni fədxuluha xalidin.

Gözünə vənnəcmu yazdı, qaşına vənnaziat,
Alnına nəsrün minallah, görünür eynül-yəqin.

Sidreyi-tuba boyundur, sərvi-həqqin həqqinə,
Üzünə vəşşəms gəldi, saçına həblülmətin.

Şə'ninə əlhəmdülillah gəldi həqdən bəyyinat,
Ləblərin yadına münzil oldu min mai-məin.

Kafü nunun hər nə kim, gəldi vücuda zübdəsi,
Sabit oldu kim, ləbindir mühbitü ruhil-əmin.

Laşək oldu çün sən oldun qibləgahi-aşiqan,
Vəscudu əmrini həqdən bilməyənlər bəs ləin.

Ey Nəsimi, çün eşitdi bu Ütarid nəzmini,
Caməsin çak etdi ol dəm oda saldı dəftərin.

Gəlgil ki, nuri-didə cəmalındadır sənin,
Dövri-qəmərdə fitnə hilalındadır sənin.

Ağzın çü mim, zülfü qaşın nunü dal imiş,
Könlüm həmişə mim ilə dalındadır sənin.

Zülmət içində çeşmeyi-heyvan imiş ləbin,
Xızrın həyatı abi-zülalındadır sənin.

Afaqı dutdu işveyi-hüsnün məlahəti,
Şol fitnədən ki, mərdümi-alındadır sənin.

Ta ruzi-həşr nuri-hidayətdir, ey sənəm,
Müshəfi-ləmyəzəl ki, camalındadır sənin.

Xəttin hesabını bilən əhli-kəlama sor
Şol ayətin ki, nöqteyi-xalındadır sənin.

Istər Nəsimi vəslini həqdən könül ilə,
Onun muradü kamı vüsalındadır sənin.

Dönmüşəm qəmdən hilala şol məhi-taban üçün,
Qılmışam qurban bu canı şol şəhi-xuban üçün.

Zülf dağıtmış rüx üzrə, örtər imanı, məgər
Ruma gəlmiş kafiri-Çin qarəti-iman üçün?

Gərçi ehsanı cəfadır yarına yarın müdam,
Daima şükr eylərəm şol daimül-ehsan üçün.

Gövhəri kanında buldu, hər ki, buldu cövhəri,
Cövhəri ol, cövhəri bul, cövhəri hər kan üçün.

Düş mühiti-eşqə, istə lö'löi-şəhvarını,
Canını dəryaya atma gövhəri-ümman üçün.

Eşq meydanında hər kim olmadı Isfəndiyar,
Bəlkə Söhrab olmadı şol Rüstəmi-dəstan üçün.

Çün ləbin abi-həyatı hasil oldu Xızra tək,
Zülm ola zülmata varmaq çeşmeyi-heyvan üçün.

Gərçi tökdü işvəsi şirin dodağın qanımı,
Şər'ilə kimdir soran yarğuyu yüz min qan üçün.

Ey Nəsimi, Fəzli-həqdən çün qənisən, fariğ ol,
Gör bu dövranı, qayırma gərdişi-dövran üçün.

Nuni-eynin vəhyinə həqdən işarətdir bu gün,
Leylətül-me’raca zülfündən işarətdir bu gün.

Səlsəbilindən gəl, ey saqi, içir ariflərə,
Çünki bayram olduvü həcci-ziyarətdir bu gün.

Xubların iqlimini dutdu camalın hüsn ilə,
Ey əmiri xubların, dövri-əmarətdir bu gün.

Ey fəqih, endi səmadan arifə mai-təhur,
Şübhədən arın ki, əyyami-təharətdir bu gün.

Ey verən yarın vüsalın künfəkanın varına,
Gör ki, bey’indən necə külli xəsarətdir bu gün.

Vermişəm kövnü məkanı dilbərin didarına,
Şol ticarətdən ulu qanqı ticarətdir bu gün.

Kim ki, həqqin surətin üzündə zahir görmədi,
Adı yar önündə gözsüz, bibəsarətdir bu gün.

Zərqü təzvirin əsası oldu, ey zahid, xarab,
Eşqə me’mar ol ki, mə’mur ol imarətdir bu gün.

Həşrü nəşrin saəti gəldivü həm yövmülhesab,
Uyqudan oyan kim, ol gündən ibarətdir bu gün.

Yuca yerdən dəm uran şeyxü fəqihə gəl de kim,
Müddəinin hörməti həqdən həqarətdir bu gün.

Damunun’ narında, şəksiz yanəsərdir ta əbəd,
Kim ki, eşqin atəşindən bihərarətdir bu gün.

Ey Nəsimi, həq Süleyman mülkünü verdi sana,
Hər sözün min Asəfi-sahibvəzarətdir bu gün.

Aləmi qıldı münəvvər, şol üzü mahı görün,
Qüdrətüllahdır camalı, qüdrətüllahı görün!

Xubların şahı əzəldən şol sənəmdir ta əbəd,
Dövləti-hüsnü müxəlləd xublara şahı görün!

“Mö’minin mir’atı mö’mindir”, dedi Xeyrülbəşər,
Güzgüyi-safi dutun, güzgüdə Allahı görün!

Zahidin mətlubu cənnət, aşiqin məqsudu yar,
Rahı anın həqmidir, ya aşiqin rahı, görün?

Razımı faş etdi ahım, aləmə çaxdı məni,
Aşiqi risva qılan şol pərdədər ahı görün!

Xaki-dərgahından oldu hər bəsirətlü bəsir,
Ey nəzər əhli, gəlin şol xaki-dərgahı görün!

Zülf ilə rüxsarını hər kimsə kim, gördü, dedi:
Şam ilə bir yerdə cəm olmuş səhərgahı görün!

Piri-Kən’anın əzizi, Misri-hüsnün Yusifi,
Üzünə baxın, zənəxdadındakı çahı görün!

Gözləri, qaşı, rüxü, zülfü çəridir hüsnünə,
Ləşkəri yəğmaçı şol fəttan şəhənşahı görün!

Ənbərəfşan cə’di-zülfün arzular könlüm anın,
Şol uzun əndişəyə bu dəsti-kutahı görün!

Dilbərin yolunda xak oldu Nəsiminin adı,
Həqqə minnət, şol fəqirin həşmətü cahı görün!

Can həmişə ol günəş rüxsara döndərmiş üzün,
Şeş cəhətdən şol büti-əyyara döndərmiş üzün.

Kə’bədən döndərdi üzün kim ki, gördü üzünü,
Gör nə göyçək qibleyü divara döndərmiş üzün.

Ba vücud ol kim, tökər qanımnı çeşmi-məst ilə,
Gecə-gündüz nərgisi-xunxara döndərmiş üzün.

Aşiqin üzü həmişə dilbərə qarşı dönər,
Abidi gör kim, necə divara döndərmiş üzün.

Incə zülfün bəndinə könlüm dolaşmışdır, vəli
Gahi-gah şol türreyi-tərrara döndərmiş üzün.

Can quşunu uçuranda buldu iman hər kim ol,
Canü dildən ol pərirüxasara döndərmiş üzün.

Ey Nəsimi, kainatın halına sən baxma kim,
Çünki canan daima dildara döndərmiş üzün.

Ey ləbin abi-çeşmeyi-heyvan,
Təl’ətindən xəcil məhi-taban!

Qamətindən qiyamət oldu zühur,
Eyyühənnas, əlləməl-Qur’an.

Həq kəlamı üzün bəyanıdır,
Ənzəruna bisurətir-rəhman!

Alimül-elm cümlə əşyasan,
Ma ləna qeyrəküm vəla dəyyan.

Zahirü batin, əvvəlü axır
Səndən ötrü zühuri-şərhü bəyan.

Zati-mütləqsən, ey xücəstəliqa,
Küntü kənzin bəyanı oldu əyan.

Küfrü iman süfatı zülfü rüxün,
Bilməyən küfrü bilmədi iman.

Sirri-tövhidə irmədi münkir,
Adəmə səcdə qılmadı şeytan.

Həqqi bildi, Nəsimi, həqq illədir,
Həq bilənə nədir bu mülki-cahan?

Lə’lindən axır, ey can, çeşməyi-abi-heyvan,
Gəl Xızra sor kim, içdi olduvü məstü heyran.

Səni bu hüsn ilə ey, kim gördü yerdə, göydə,
Bu lütf ilə sənə can həqdən irişdi bürhan.

Vəslin həyatı gəldi, əyyami-vəsl irişdi,
Firqət vüsala döndü, getdi bu acı hicran.

Hüsnün təcəllisindən düşdü cahana şö’lə,
Ey pərtövi-xudayi, sənsən çü nuri iman.

Doğdu günəş camalın nuru cahan içində,
Aləmdə şək deyil ki, sənsən çü mahi-taban.

Dünyavü üqba, ey can, hüsnünə valeh oldu,
Mə’şuqədən çü irdi həm lütf ilə, həm ehsan.

Səb’ülməsani oxur hər dəm üzün günündə,
Hüsnündə öylə bil ki, aşkara oldu Qur’an.

Çün xubların əmiri sənsən, Nəsimi, imdi
Sənsən cahan içində bu gün əmiri-xuban.

Bu can pərvanədir, yanır camalın şəm’i tabından,
Könül darülqərar oldu pərişan zülfü tabından.

Həyatı Xızr ilə Isa bilir, arif necə buldu,
Rümuzi-eşq ilə irdi dodağın eyni-abından.

Əcəb cimi, səadətdir kimə kim, pərdə rəf oldu,
Dü aləm doldu şövqündən, günəş çıxdı hicabından.

Münəccim, zahid inanmaz ki, sənsən əhsəni-təqvim,
Əzəldən ta əbəd oldu əyan hüsnün kitabından.

Üzün nuru şol atəşdir kim, anı bilmədi zahid,
Şəcərdən Musaya inni-inəllahdır xitabından.

Susuz, həm ac, yuxusuz bəriyyə çəkdirir hüsnün,
Girəm Beytül-həram içrə, qılam ta səcdə babından.

Məni şol müddəi sanır irağam yə’ni tapundan,
Zəhi cahil ki, qəflətdən oyanmaz qaldı xabından.

Nəsimi necə vəsf etsin ki, hüsnün binəhayətdir,
Tutuldu dili əflakın, sual etdim, cavabından.

Dəmi-Isa gəlir dodağından,
Ay kimi nur axar yanağından.

Zülfünün teyləsanı şol gecədir
Ki, günəş nur alır çırağından.

Yanəsərdir bu dağü həsrət ilə
Kim ki, yanmaz bu eşq dağından.

Qaməti şol şəcər degil ki, yana
Hər kişinin çırağı yağından.

Eşq əlindən dolu əyaq içərəm,
Həm budur umduğum əyağından.

Sağa dəyşirdi solunu, həqqa,
Solunu kim ki, bildi sağından.

Gəldi Musayə ləntərani cavab,
Ərini vəxti Tur dağından.

Can nə quşdur ki, qurtula deyəsən
Ənbərin zülfünün duzağından.

Gözlərinin qarası, həm ağı,
Fərq edilməz qarası ağından.

Zülfünün xoşnəfəs Nəsimi kimi
Gəlmədi bir qubar ayağından.

Bu türfə şəm'i gör ki, axar şəkər dodağından,
Əcəb ki, münfəil olmaz qəmər yanağından!

Bənövşə zülfünə batil təşəbbüh etdi özün,
Səba, çıxar bu xəyalı anın dəmağından.

Həmişə sərvi-səhinin budağı bibər olur,
Görün bu sərvi ki, susən bitər budağından.

Zəmanə zülfü rüxündən bəlayə saldı məni,
Həm ol zaman ki, seçildi qarası ağından.

Qəriği-bəhri-qəm etdi məni bu şivə ilə,
Gəlir təfərrüc edər hər zaman qırağından.

Əgər ayağına düşmək macalım olsaydı,
Dəxi götürməz idim baş anın ayağından.

Zəmanə çeşmi-çırağı, Nəsimi, yarındır,
Gətür çırağını yandır anın çırağından.

Təcəlli dutdu afaqı camalın şəm'i-tabından,
Məgər kim, təl'ətin ayı əyan oldu niqabından.

Nə huriçöhrəsən, saqi, mütəhhər cismi-ruhani
Ki, can sərməstü dəng oldu ləbi-lə'lin şərabından.

Məgər əşrati-saətdir qaşınla kirpigin, zülfün
Ki, heyran oldu hasiblər bu Qur'anın hesabından.

Itabı şöylə şirindir dodağın işvə vəqtində
Ki, aşiq can yağar sanur anın nazü itabından.

Camalın müshəfi, yarəb, nə göydən münzil oldu kim,
Iki hərf oldu kafü nun onun hüsnü kitabından.

Gözün dövrani-aləmdən götürdü zöhdü təqvayı,
Məgər axırzaman oldu, oyandı fitnə xabından?

Hüvəllahüs-səməd söylər xətin, əlhəmdülillah kim,
Üzündən pərdə rəf oldu, günəş çıxdı hicabından.

Cəəlna sabit oldu kim, dodağın vəsfini söylər
Kim, oldu külli-şey'ün həyy dodağın eyni-abından.

Açıldı zülfü xalından mana iman-din babı,
Bu hərfü nöqtəyi gör kim, nələr fəth oldu babından.

Əgərçi zikri-təsbihin savabı çoxdur, ey zahid,
Mən onu eşqə dəgşirdim, anın keçdim savabından.

Nəsimi çün vüsalından irişdi cənnətü hura,
Nə məhşərdən hesab eylər, nə damunun əzabından.

Cani-aləmsən, əya siminzənəx, əbrukaman
Kim, camalın müshəfindən könül oldu səb'əxan.

Nuri-çeşmi-əhli-dilsən, ya həyati-cavidan,
Ya kəlami-natiq, ey şahi-cahani-laməkan.

Surətin cənnət, ləbin kövsər, sözün abi-həyat,
Hər kim içdi ol şərabı, oldu həyyi-cavidan.

Surətin ayinəsində həqqi zahir görməyən,
Cahili-bəlhüm-əzəldir ol ləini-bizəban.

Əhsəni-surətmisən ya, məzhəri-fəzli-ilah
Kim, camali-hüsnünə pirü cavandır canfəşan.

Vasil olan ol həbibə buldu vəsli-daimun,
Aşiqü mə'şuq birdür, gör kəmali-aşiqan.

Ta camalın müshəfin gördü Nəsimi, ey nigar,
Xalü xəttün sirrini əz Fəzli-həq qıldı əyan.

Nə hüsn olur ki, yayılmış bunca hüsniyat andan,
Nə surətdir ki, oxurlar bu ismi eyni-zat andan.

Zəhi pakizə gövhər kim, nə hüsnü xəttü xal olmuş,
Səkiz cənnət əyan oldu bu səb'i-sünbülat andan.

Qaşun nun vəl-qələm, qəddin təbarək əhsən, ey dilbər,
Mübarək nüsxədir vəchin oxur vənnaziat andan.

Üzün eydinə ta irdim, səyami-hicr məhv oldu,
Yenə əyyami-vəsl oldu, tükəndi hicriyat andan.

Camalın xubluğu qəsri-fələkdən öylə ə'ladır,
Əgər bir gün güzar etsə, mələk tökər qanat andan.

Hər ol sufi ki, bu hüsnə ibadət qılmadı candan,
Özünü lə'nətə bandır, namazın oda at andan.

Nəsimi, gəl sücud eylə bə-vəchüllahə ki, həqdir,
Anın şə'nində gəlmişdir bu munca vəscüdat andan.

Ol pəripeykər ki, taci-səltənət başındadır,
Çinü Maçini müsəxxər eyləmək başındadır.

Tutiyayi-çeşmi-binadır ayağı torpağı,
Səcdəgahi-arifan ol qövsünün qaşındadır.

Bu qəmər dövründə hərgiz görməsin şahim zaval,
Üç otuz on yaşı olsun, on iki yaşındadır.

Sehr ilə eylər imamət gözləri aşiqlərə,
Qibleyi-azadələr həm çeşm, həm qaşındadır.

Şərbəti-abı şərabü ahü dərdü xuni-dil,
Ey Nəsimi, bil həqiqət, aşiqin aşındadır.

Ta kim, ol məhbubi-dilin lə’li cami-badədir,
Rəhni-meyxanə həzaran xirqəvü səccadədir.

Əzmi-bustan eylədi ol qaməti şümşad şad,
Sərvi-azədəyi gör kim, qayğudan azadədir.

Adını gördüm yazılmış şol təhəyyürnamədə,
Didə heyran şol hümayun xətti-hüsni-adədir.

Kim ola xurşidi-taban, də’viyi-hüsn eyləyə,
Zərrədən kəmtər yolunda sübhü şam üftadədir.

Hər zaman bağlar xəyalın sibi-qəbqəb nəqşini,
Qeyri-nəqşi-hüsni-dilbər lövhi-xatir sadədir.

Istərəm lə’li-ləbindən şərbəti mən xəstədil,
Dadımı hər kim eşitsə, deyə kim, dildadədir?

Vəslini qıldı Nəsimi arzu, bu əqli gör,
Sən gədayi-binəvasan, ol şəhü şəhzadədir.

Yarü dilbər səndən ayrı kim dedi aləmdə var?
Qanı səndən özgə dilbər, qanı səndən özgə yar?

Ey gülər gülgün yanağın cənnətin xəndan gülü,
Gəl ki, anın firqətindən bağrımı yandırdı xar!

Çıxdı məğribdən günəş, kəşf etdi eşqin rəmzini,
Pərdəsi açıldı, hüsni-dilbər oldu aşikar.

Çün mana eşqin təriqidir sirati-müstəqim,
Doğrudur həqdən təriqim, neylər əğyar onda yar?

Zağ ilə bir yerdə tuti gərçi barışmaz, vəli
Alamaz təqdir əlindən kimsə, ey yar, ixtiyar.

Din ilə imanıdır əhdə əmanət aşiqin,
Kimdə kim, yoxdur əmanət, bil kim, oldu əhli-nar.

Aşiqin me’marı həqdir, yapar anın batinin,
Ey evin həqdən yapılmış, sənsən əhli-e’tibar!

Dövləti-didara bidar uğrar, ey gerçək mühib,
Gözləri açıq gərəkdir aşiqin leylü nəhar.

Gərçi ağudur fəraqın şərbəti aşiqlərə,
Eyləməz vəslin şərabı içənə ol ağu kar.

Mə’rifət kəsb eylə, ləhvü lə’bə məşğul olma kim,
Gör nə surət göstərir hər dəm oyunçu ruzigar.

Çün bəqasıdır cahanın malü mülkü ne’məti,
Dövləti-Mənsura yapış, istə ömri-payidar.

Eşq əlindən gəl şərabi-səlsəbilü kövsər iç,
Keç bu meydən kim, çəkərsən ertə rəncindən xumar.

Gül fəraqından gəl, ey bülbül, səbur ol, ağlama,
Qış keçər, xəndan olar gülşən, gələr fəsli-bahar.

Doğru söz doğrar həsudun bağrını şol mə'nidən,
Münkirə oldu Nəsiminin kəlamı zülfiqar.

Aləmdə bu gun sənciləyin yar kimin var?
Gər var desən, yox deməzəm, var, kimin var?

Dildari-məcazi bulunur aşiqə yüz min,
Bənzər sana təhqiqdə dildar kimin var?

Tatara saçın tozunu tüccar ilə göndər,
Ta kim, bilələr nafeyi-tatar kimin var.

Ey buncuğu dürdanə sanan, gövhərini bil,
Ta kim biləsən lö'löi-şəhvar kimin var?

Əyyar kimi türrəsi məndən könül aldı,
Şol türrə kimi dilbəri-əyyar kimin var?

Məhbub qəmər üzlü, boyu sidrə ögüşdür,
Yanaqları gül, lə'li şəkərbar, kimin var?

Eşqin qəminə eyləmişəm könlümü məxzən,
Bir mənciləyin məxzəni-əsrar kimin var?

Gərçi gecəsi mətləül-ənvardır anın,
Zülfü kimi bir mətləül-ənvar kimin var?

Ey nisbət edən üzünü gülzar ilə bağa,
Üzütək anın gülşənü gülzar kimin var?

Isbat edərəm daim ənəlhəqqimi həqdən,
Bir mənciləyin aşiqi-bərdar kimin var?

Can ilə cahan yara fəda qıldı Nəsimi,
Anın kimi bir yari-vəfadar kimin var?

Camalın pərtövi-nuri-xudadır,
Yolunda aşiqin canı fədadır.

Ləbi-lə'lin müsəffa şərbətindən
Bu məcruh könlümə, cana, dəvadır.

Yaxıldım eşqinə manəndi-Məcnun,
Xəyalın eynimə Leylinümadır.

Necə Fərhadvəş könlüm alıbsan
Ki, Şirintək camalın dilrübadır.

Nəsimi can fəda qıldı nigarə,
Dəmadəm eşq ilə işi səfadır.

Uyumaz fəraqindən gözüm yaş tökərü qan axıdar,
Lə'lin qəmindən dəmbədəm yaqutü mərcan axıdar.

Yandırdı şövqün canımı, dəldi fəraqın bağrımı,
Eşqin bəlası başıma gör kim, nə tufan axıdar.

Nitqindən oldum çün diri, eynəl-yəqin oldu bu kim,
Lə'lindürür ol Isa kim, ağzın açar can axıdar.

Gəlgil unutma yarını, halın gör anın, sor anı,
Şövqündən, ey dürdanə, gör gözdən nə ümman axıdar.

Şol incü surətli dişin gəlmiş xəyalı eynimə,
Ağzımdan əsdafı anın lö'löi-qəltan axıdar.

Dürdündən, ey huriliqa, məstanə sun safi-şəfa,
Kim, şərbətindən hər nəfəs min dərdə dərman axıdar.

Nuhun gəmisin istə kim, yetişdi tufan qopmağa,
Seylabi-şövqü şöylə kim, bu çeşmi-giryan axıdar.

Mişkin saçın çövkanına çün başımı top etmişəm,
Eşqin bəlasından yenə ol topu çövkan axıdar.

Lə'li-ləbin təfsirini söylər Nəsimi canlara,
Şol rəsm ilən kim, sanasan Xızr abi-heyvan axıdar.

Afitabın təl’ətindən mahi-taban ru tutar,
Çini-zülfündən Xətada nafeyi-ahu tutar.

Bilmənəm hurimisən, yoxsa məlaik, ya pəri,
Kim ki, gördü ay üzün şərməndə oldu, xu tutar.

Bər-kənari-çeşmimə basğıl qədəm, ey sərvinaz,
Sərvə adətdir ki, məskən bər-kənari-cu tutar.

Görmüşəm, həm qanda kim, aslan qılır ahu şikar,
Mən əcaib qalmışam, aslanları ahu tutar.

Çeşmimə dedim fərağından anın çox ağlama,
Nagəhan tufan qopar, mülki-cahanı su tutar.

Mərg aman versə, əlindən qoyma dilbər damənin,
Tutmasan, bilgil, əcəl ol xud səni niku tutar.

Qeyrət iltürmən ki, hindu bərgi-nəsrin yastanur,
Xublara adət nədən, lələ müdam hindu tutar.

Müshəf açdım, falıma gəldi camalın ayəti,
Əhli-tövhidin kəlamı falımı niku tutar.

Ləblərinin şərbətindən bir qədəh sun, saqiya,
Lə’lini içdi Nəsimi, hər zaman bir ku tutar.

Səhərdə gül üzün şaha, çü gülşəndə gülab oynar,
Anı görüb səfasından fələkdə afitab oynar.

Əcəb zati-mütəhhərsən, nəzirin yoxdur, ey dilbər,
Vücudun nuru bərqindən camalında inqab oynar.

Çü gördü qəbqəbin eynim, dedi görün tamaşayı
Ki, lə'lin höqqə altında müəlləq durmuş ab oynar.

Qurulmuş məclisi-şahi, çalınır çəngü ney, qanun,
Tərənnümlər qılır mütrüb, ara yerdə şərab oynar.

Fələk tərsinə dövr eylər, məgər axır zaman oldu,
Qəfəsdə tutiyü qumru, çəmənlərdə qürab oynar.

Fərəhdən cümlə üşaqqın fəğanı göylərə ağdı,
Həsəddən zahidi-xüşkün qabağında xunab oynar.

Nəsimi, uşbu ənvarın şüasından münəvvərdir,
Kitabü nərdü şətrəncü odü yel, su, türab oynar.

Şəha, könlümdə daim bir həvəs var,
Soram şəkər dodağından məgəsvar.

Sənin gülgün yanağın həsrətindən,
Axar çeşmim yaşı həm çün Ərəsvar.*

Gəl ey ömri-əzizimdən əzizim
Ki, sənsiz keçədür ömrüm əbəsvar.

Qənim olsun mana Fürqanü Incil,
Əgər könlümdə səndən özgə kəs var.

Qulağıma gəlir hər gecə ta sübh
Rəqiblərin ünü həm çün cərəsvar.

Sənin tərkini qılmaz bu Nəsimi,
Necə ki, bu qəfəsdə bir nəfəs var.

---

* Araz çayı kimi.

Üzün güldür, ləbin lə'li-şəkərbar,
Gözün cadu, saçındır mişki-tatar.

Mən aşiq olmuşam şol xəttü xala,
Əgər qanım tökərsən, əllərin var!

Mənəm yardan cüda, ol yar məndən,
Ilahi, olmasın hiç kimsə biyar!

Ayağın torpağından tutiyatək,
Həzaran müştəri vardır xəridar.

Nəsimi halını sorgil, nigara,
Kəməndi-eşqinə olmuş giriftar.

Bir dəxi görmək camalın könlüm, ey can, arzular,
Xəsteyi-dərdi-fəraqın dərdə dərman arzular.

Ey üzün cənnət, boyun tuba, sözün abi-həyat,
Qulluq etməklik tapunda hurü qılman arzular.

Gər səni arzularam, ey canü cananım, nola,
Təşneyi-vəslin, nigara, abi-heyvan arzular.

Ta gülüstani-Irəm rüxsarını gördü gözüm,
Bülbüli-şeyda kimi hər dəm gülüstan arzular.

Gördü tupi-qəbqəbi-simin, çövkan zülfünü,
Tifli-ruhum neyləsin, ol tupü çövkan arzular.

Könlümüz arzuladı gər vəsli-cananı, nola
Kim, yəqindir arzular dərviş, sultan arzular.

Bax axır xəstə Nəsiminin xəyali-xamına,
Xatiri dərbəndi-zindan, hurü qılman arzular.

Dildarə müştaq oldu can, anın camalın arzular,
Hicrinə qatlanmaz könül, yarın vüsalın arzular.

Yandırdı şövqün bağrımı, gör tabişindən kim, necə
Canım susamışdır, ləbin abi-zülalın arzular.

Yaxmaq gərəksən yaş ilə hər dəm gözün məsbahini,
Gər gözlərin gerçəkləyin anın xəyalın arzular.

Çərxin hilalü bədrinə könlüm qaçan baxmaq dilər,
Neçün ki, üzün bədrivü qaşın hilalın arzular.

Aşiqlərin azarına gör kim necə bel bağlamış,
Şol bivəfa aşiqlərin neçün vəbalın arzular.

Çin nafəsindən bezdi can, ənbərdən usandı könül,
Hər sübhdən şol dilbərin zülf ilə xalın arzular.

Yarəb, nə huri-çöhrədir şol mahi-taban üzlü kim,
Gördükcə anın üzünü, günəş zəvalın arzular.

Şəhdin hədisi həm şəkər xoş gəlməz ol müştaqə kim,
Şol ruhi-qüdsün məntiqi şirin məqalın arzular.

Eşqində qurban olduğun istər Nəsimi, sor nədən,
Şol mə’nidən kim, dünyada hər şey kamalın arzular.

Neylərəm mən bunda durub, çünki dildar andadır,
Sanma kim, anda dedigim Bursa ya Larandadır.

Neylərəm gülzara baxmaq, çün bu yanmış könlümün,
Şol boyu sərvi-xuraman, üzü gülzar andadır.

Firqətin dərdi məni torpaq edərsə, ey səba,
Yarı qıl, torpağım, ilət anda kim, yar andadır.

Can yanağın həsrətindən dəgməniz, olmaz cüda,
Qanda kim görsə güli-tər, bülbüli-zar andadır.

Şol moğolçin gözlərinlə çünki qapdın könlümü,
Çün bilirsən kim, nə gizli dürlü əsrar andadır.

Dərdimi artırma, lütf et, şərbətinlə, ey həkim,
Çün məni sayru qılan şol çeşmi-bimar andadır.

Dişlərin əksi Nəsiminin gözünə düşəli,
Bəhri-bəhreyn olduvü lö'löi-şəhvar andadır.

Nə sün’i-paki-yəzdansan, a dilbər?
Müsəvvərsən, müənbərsən, münəvvər!

Saçındır zülməti-yəlda, şəbi-qədr,
Üzün novruzü eydü mahi-ənvər.

Təcəllidən ki, ta açdın niqabı,
Həbibin təl’ətidir mahi-xavər.

Bu, xalü rüxmüdür, ya mürği-sevda
Ki, qonmuşdur miyani-vərdi-əhmər.

Vüsalın dilərəm şirin ləbindən,
Cavabım ver ki, qənd olsun mükərrər.

Çü cənnət tubisidir qamətin kim,
Ki, qoymuş surəti-rəhmani bərsər.

Şu cövhərdir bu gün heyrani-hüsnün
Ki, seyrangahıdır çərxi-müdəvvər.

Degil, aydır bu söz həddin, Nəsimi,
Kəlamüllahı gör, bu vəsfi söylər.

Görün ki, bəhri-məani nə qəsdi-can eylər,
Sifati-surəti-rəhmani xoş bəyan eylər.

Qaşın, gözün nəzəri, bil yəqin ki, həqdəndir,
Həqin nəzərgəhi bilgil nə tərcüman eylər.

Təriqət ər dilər isən həqiqətə başla,
Həqə könül vericək eşq ona nişan eylər.

Bu gənci-vəhdətə gir gör sifati-ləmyəzəli
Ki, kafü nuna irişən özün əyan eylər.

Əyan gözün aça gör, yarı bigüman görgil,
Ki, yarı görücügəz çox sənə bəyan eylər.

Hədisi-eşqü məhəbbət vücud içində gəlir
Ki, nunü vəl-qələmin sirrini əyan eylər.

Gəl, ey Nəsimiyi-sərgəştə, canı tərk eylə
Ki, can qəfəsdən uçar, əzmi-cavidan eylər.

Götür niqabını xəlqə görün, ey şəmsü qəmər,
Görüb utana ləbindən nabatü şəhdü şəkər.

Gözünü nərgisə kimdir ki, bənzədir, yarəb,
O qafil bixəbər gör kim, necə qıldı nəzər.

Əbirü ənbər utandı camalını gördü,
Saçın xəyalına irməz məşami-badi-səhər.

Əzəl günündə oxudum üzündə uş taha,
Bu rəmzi kim, anı heç kimsə verməmişdi xəbər.

Səni bu lütf ilə kimdir deyən ki, ey dilbər,
Bu surət ilə sana kim dedi ki, üştə bəşər?

Əzəldə düşdü camalın təcəllisi Tura,
Ya Musa, anı mana sor ki, yandı nara şəcər.

Həqi bu rəsm ilə tanı, dəxi həqiqət bil
Ki, həq ilə yerü göy dopdoludur bəhr ilə bər.

Hur ilə insü mələk bəndə oldu cümlə sana,
Bu hüsnə aşiq olmayanın adı oldu həcər.

Qələndər ilə təcrid, fəna – üçü birdir,
Nə qəm, bu üçünə aləm olursa zirü zəbər.

Irişdi mö'cüzü həqqin Nəsimiyə çünkim,
Anın üçün ki, ana həq dedilər əhli-nəzər.

Boyundur sidrəvü tuba, dodağın abi-heyvandır,
Anın mahiyyəti-zövqün nə bilsin ol ki, heyvandır.

Üzün inna-fətəhnadır, təbarək şə’ninə münzəl,
Bu vəchi əhsəni-surət bilənlər əhli-irfandır.

Xətin ümmül-kitabıdır bəyanı əhli-tövhidin,
Hürufu lövhi-məhfuzun müsəvvər şərhi-Fürqandır.

Rüxün gülzarına qarşı qızardı məğribin rəngi,
Tüluyi məşriqin rəngi nəsimi-ənbərəfşandır.

Hədisi gövhərəfşanın həqiqətdir nəhayətsiz,
Üqulu əhli-irfanın onun hərfində heyrandır.

Nəsimi çün səni gördü münəzzeh oldu aləmdən,
Gözündə surəti-rəhman, dilində zikri-sübhandır.

Mənim yari-vəfadarım, gəl axır,
Mələk surətli dildarım, gəl axır.

Fəraqın canımı yaxdı bəğayət,
Həbibim, munisim, yarım, gəl axır.

Mənəm bülbül kimi nalanü giryan,
Dodağı qönçə gülzarım, gəl axır.

Qaşın qarşısına canım bərabər,
Mənim tirü kamandarım, gəl axır.

Fəraqından qatı divanə oldum,
Kərəm qıl, zülfü zünnarım, gəl axır.

Sənintək görmədim bir gül cahanda,
Bənövşə, tazə ruzgarım, gəl axır.

Qərarım qalmadı, səbrim tükəndi,
Ləbi lə’li-şəkərbarım, gəl axır.

Nəsimi natəvandır çün qəmindən,
Gəl ey canım, gəl ey yarım, gəl axır.

Gətir, gətir, gətir ol kaseyi-rəvanpərvər,
Gətir, gətir, gətir ol çəngi, bir nəva göstər.

Verim, verim, verim öz canımı mən ol yara,
Öpüm, öpüm, öpüm ol lə'li şəhdilə şəkkər.

Ləbin, ləbin, ləbinizdən əqiq oldu xəcil,
Dişin, dişin, dişinizdən bəhanəsiz gövhər.

Sözün, sözün, sözünüzdən əridi qəndü nabat,
Qaşın, qaşın, qaşınızdan dü kirpiginlə – cigər.

Məni, məni, məni qəmzən oxu bilə urdu
Sənin, sənin, sənin ol cadu gözlərin yeksər.

Saçın, saçın, saçınızdan xətayi-mişk xəcil,
Üzün, üzün, üzünüzdən tutuldu şəmsü qəmər.

Yəqin, yəqin ki, yəqindir Nəsimiyə, şəksiz,
Həbib, həbib, həbibdir dilində kim, söylər.

Sənin eşqindir, ey dilbər, mana həm mürşidü həm pir,
Qəfil mən eşqinə düşdüm, nədir çarə, nədir tədbir?

Yatırkən dün gecə gördüm siyah zülfünü boynumda,
Oyandım dedim, ey dilbər, nədir bu rəmzimə tə'bir?

Divanə oldu dəli könül, saçın zəncirinə bağla,
Mənim könlüm dəlisinə sənin zülfün teli zəncir.

Vücudum padişahisən, könül verdim, səni sevdim,
Sənə könül verən aşiq qaçan can eyləyə təqsir?

Nəsimi, namusü arı əgər aşiq isən tərk et,
Aşiqlər boynuna biçmiş məlamət donunu təqdir.

Üzünü surəti-rəhman oxurlar,
Xətini sünbüli-reyhan oxurlar.

Əliftək cövhəri-yekta boyundur,
Dodağın çeşmeyi-heyvan oxurlar.

Boyun Tuba dedilər əhli-mə’ni,
Belin incə, ləbin mərcan oxurlar.

Əzəldən çün üzündür Misri-came,
Üzünü sərbəsər Qur’an oxurlar.

Üzün bağında bülbül, tuti, qumru
Həzaran suz ilə dastan oxurlar.

Üzün nuruna hər kim oldu münkir,
Ana lə’nət, adın şeytan oxurlar.

Bu gün çün hüsnünüzü yad edənlər,
Üzün şəmsü məhi-taban oxurlar.

Nə hikmətdir, əya, ey hüsnü ziba,
Səni aləmlərə sultan oxurlar?

Fəda qıl canını sən, ey Nəsimi
Ki, canı yar üçün qurban oxurlar.

Tutdu gülzari-cahanı əbri-gövhərbar bar,
Bar darəd əbri-neysan yüz şəqayiqvar var.

Var, nəzər qıl, gör nədir əz qüdrəti-səbbağ bağ,
Bağ içində yanadır hər guşədə gülnar nar.
.
Nari-gül yandırdı bülbülnü ki, qəmpərvərd vərd,
Vərd üçün daim dolanır guşeyi-gülzar zar.

Z'arzuyi-lalə sərv azad olur piruz ruz,
Ruzü şəb gülşəndə dutmaz cüz gül əz dəyyar yar.

Yar əgər zülfün çəkərsə gər dərü badam dam
Damə düşgü sünbül olğu nafeyi-tatar tar.

Tarını çeşmi-şəqayiqgirü tərfi-cuy cuy
Cuyi-can pürabi-eyş et çün macalın bar bar.

Barha ayıtdım, Nəsimi, qılma əz bidad dad
Dad ilə könül dola çün lə'li-gövhərbar bar.

Olmaya məstanə eynintək, şəha, məkkar kar,
Karıma qoymaz məni hər bab ilə əğyar yar.

Yarı əhdində vəfalı istəgil, ey dust, dust,
Dust olanlar eyləsin aşiqinə naçar çar.

Çarə istərsən əgər, sən daməni-dilgir gir,
Girü dəstəm cana salma, ey üzü ənvar var.

Varmıdır nisbət sana bir türk dər Maçinü Çin
Çini-zülfünüz yenə əz nafeyi-tatar tar.

Tari-zülfün aşiqin ruzun qılır şəbrəng rəng,
Rəngi-ali zərd olur həm, ey üzü gülzar zar.

Zardır hüsnündən ötrü ba ləbi-gülgün gün,
Gün ötər xürrəm dutar ki, nərgisi-xunxar xar.

Xarvəş ba hər kəsi sən güldən ötrü tizi tiz,
Tiz Nəsimi cisminin sən yarğusunu yar, yar.

Firqət içində yürəgim gör ki, nə parə-parədir,
Bağrımı gör bu qüssədən kim, necə yarə-yarədir.

Qəmdə yanan bu aşiqə lütfü inayət eyləgil,
Ey büt, əgərçi yürəgin mərmərü səngi-xarədir.

Lə'li-ləbin hədisini eşidəlidən, ey sənəm,
Səcdə edər mələk kimi, səcdəsi qüdsi-narədir.

Mən bu təriqü vəch ilə cövrü cəfadan usandım,
Çünki həmişə yarımın cövrü cəfası yarədir.

Yaralı eylədi məni cür'əsi ağulu qəmin,
Yaralı qoyma yarını, dərdinə gör nə çarədir?

Nazü itabü işvəsi yaxdı məni fəraqilə,
Daim onunla aşiqin işi bu rəsmü karədir.

Ayü günü nə vəch ilə üzünə nisbət eyləyim,
Hüsni-rüxün qatında çün ay ilə gün sitarədir.

Zərqü riyavü sufilik zərrəcə assi eyləməz,
Şol kişiyə ki, rəğbəti ol meyi-bixumarədir.

Hüsnünə aşiq eylədi, canımı yandırar qəmin,
Gör ki, nə ftitnələr qılur ol ki, bu hüsni-yarədir.

Zövrəqinin məhəbbətin dənizinə buraxmışam,
Gəl çək anı kənara kim, meyli anın kənarədir.

Zülfü tozundan oldu çün canü təni Nəsiminin,
Əslinə qaruşur yenə, ric'əti şol qubarədir.

Təalallah ki, sün'idən sənintək xoş camal eylər,
Yenə bədr ayın üstündə qara qaşlar hilal eylər.

Zəhi-nəqqaşi-surətgər ki, bir qətrə məni sudan
Nə göyçək hüsni-canpərvər, nə ziba xəttü xal eylər.

Üzü eyni-inayətdir şəhimin səm'inə degil:
Ki, neçin zülfünün cimi əlif qəddimi dal eylər?

Xəlayiqlər xəyal eylər ki, hüsnün Yusifə bənzər,
Əzizim yeydürür, billah, bu el yanlış xəyal eylər.

Məlalət çəkməzəm hərgiz ki, hicran bərkamal olsa,
Hər an nəsnə kamal olsa, fələk anı zaval eylər.

Yar ilə xəstə könlümün əcaib haləti vardır,
Vəleykən müddəi bilməz, bizimlə qilü qal eylər.

Nəsimi yar hicrində ümid üzməz vüsalından
Ki, Tanrı aqibət bi gün bu hicranı vüsal eylər.

Camalın əksi, ey dilbər, nəyə kim düşdü al eylər,
Anın qövsi-qüzeh qaşı bu bədr ayı hilal eylər.

Sənin ol cadu gözündən həzər kim qılmasın, şaha
Ki, hər bir baxışı yüz min füsunü məkrü al eylər.

Xəyalın hər gecə ta sübh gətirməz gözümə uyqu,
Fəraqın bağrımı qəmdən əritdi, çün zülal eylər.

Çün ol kirpiklərin zəxmi baş edər bağrımı hər dəm
Ki, bağrım qanı hər saət gözümnü malamal eylər.

Bu cövrü kim, edərsən sən Nəsimiyə, bu gün, cana,
Səni tərk eyləməz neyçün, cəfalar ittisal eylər.

Səfavü zövqi-dünyaya, könül, aldanma, al eylər,
Səni salar bu sevdaya, özü qeyri xəyal eylər.

Əgər beş gündə bu dövran sənə əl versə, ey aqil,
Ki, şadlıq göstərər bir dəm, dönər yüz min məlal eylər.

Yığınca munca əsbabı yeri, sən bir kamal istə,
Əcəl yeli əsər bir gün ana çox-çox zaval eylər.

Əgər aşiq isən tərk et, nedərsən munca əsbabı,
Olar ki, eşqə qərq oldu, qaçan sevdayi-mal eylər.

Günəş dutuldu dedilər nəzər qıldım camalına,
Üzünə zülfüdür düşmüş, bu el yanlış xəyal eylər.

Yığıb yedirməyən kişi sinində mar olur malı,
Sağı sözdür ki, assi varsa boynunda vəbal eylər.

Nəsimi xəstəyə sənsiz Süleyman mülkünü versən,
Ol anı bir çöpə saymaz, təmənnayi-vüsal eylər.

Şahidi-laşərikə ləh şol sənəmin camalıdır,
Leysə kəmislihi anın nun ilə mimü dalıdır.

Çöhrəsi gərçi nur ilə kəşfi-hicabi-vəch edər,
Vəchə işarət eyləyən ol qəmərin hilalıdır.

Gərçi hər ayda bir gecə aya kamal irir, vəli
Yüz qəmər irməz anda kim, ol qəmərin kamalıdır.

Surəti gərçi hüsn ilə cuşa gətirdi aləmi,
Fitnəyi qoparan anın qaş ilə zülfü xalıdır.

Axirətin nəiminə olma hərisü baxma kim,
Hur ilə cənnətü liqa cümlə anın vüsalıdır.

Mehri-rüxün nə vəch ilə qabil ola zavala kim,
Vəsfi-camalın, ey günəş, ayəti-bizəvalidir.

Şübheyi-laşərikə ləh ta biləsən ki, məndə yox,
Güzgüyə baxü güzgüdə gör ki, nəyin misalıdır.

Vəslə qənaət etmişəm, dünyavü axirət sana,
Aşiqə şol müşahidə ne'məti-layəzalidir.

Şükr edərəm ilahimə hər nəfəs, ey Nəsimi kim,
Əhli-kamala məntiqin rəhməti-zülcəlalidir.

Mətləi-hüsnün, ey sənəm, məzhəri-layəzalidir,
Cümleyi-kainat onun pərtövünün zülalıdır.

Baxdı cahana bir nəzər şahidi-laşərikə-ləh,
Çöhrəyi qıldı vasitə, mütləq onun vüsalıdır.

Surətə düzdü mə’niyi-leysə kəmislihi, dedi:
Surəti mə’ni eyləyən qüdrəti-pürkamalıdır.

Cilvə qılıb camalını, xublara höccət eylədi,
Sün’ünə qıl müşahidə, gör nə əyan camalıdır.

Baxsa olur müayinə yüzünə bihicab, anın
Çöhrəsinin təfərrücü ne’məti-layəzalidir.

Axirətin mətainə müştəri olma, istəmə
Hər nə ki, anda var isə, cümlə bunun misalıdır.

Şükr ilaha eylərəm dəmbədəm, ey Nəsimi, kim,
Gör bu camalı la tühəb, rəhməti-zülcəlalidir.

Könlümdə mənim eşqi-camalın əzəlidir,
Şol nəsnə kim, oldu əzəli, ləmyəzəlidir.

Nəfsini biləndir ki, yəqin rəbbini bildi,
Həqdən bu məqamata irən bil ki, vəlidir.

Nəfsini bilən bil ki, həqi bildi həqiqət,
Inkarına bel bağlama kim, qövli-Əlidir.

Ey üzü turuş xəl kimi zahid, meyə sun kim,
Safi ləbinin dadlu şərabı əsəlidir.

Ey yarını dünyayavü üqbaya verən, gəl,
Bul nəsnəyi dünyada ki, yarın bədəlidir.

Endirmədi baş əhsəni-təqvimə əzazil,
Anı buraxan lə'nətə, anın cədəlidir.

Idrak edəməz surətini görməyən ə'ma,
Şol mə'niyi kim, hüsni-camalında cəlidir.

Saf olmayan altun kimi mehrinlə cahanda,
Şol üzüqara qəlb imiş, adı zəğəlidir.

Ey yara fəda eyləmyən canını aşiq,
Mə'şuqdan uy vermə ki, eşqin əməlidir.

Aşiqlərinin qanına bandırdı əlin dost,
Şol qana girən daim anın simin əlidir.

Çün buldu Nəsimi əbədi ömr saçından,
Şol dirliyi neylər ki, zamani-əcəlidir.

Hüsnün, təbarəkallah, ənvari-ləmyəzəldir,
Üzün cahan içində bimislü bibədəldir.

Eşqin əsası, ey can, qabil degil zavala,
Neçin ki, mülki-hüsnün mülki-bilaxələldir.

Ey hikmətin rəisi, mə’lulü illəti qoy,
Əvvəl bu cövhəri bil kim, məbdəi-iləldir.

Cənnətdə gərçi həqdən balü mey oldu və’də,
Lə’lin gərək mana kim, həm meyü həm əsəldir.

Ey badeyi-səqahüm lə’li-ləbin şərabı,
Ikrah edən bu meydən içdigi əkşi xəldir.

Mehrin odunda şol kim, pak olmadıvü xalis,
Qəlbi qəşidir anın, üzü qara zəğəldir.

Ey səndən ayrı könlüm, vəhşi iki cahanda,
Eynin əcəb qəzalə, hüsnün əcəb qəzəldir.

Can ilə həm cahanı tərh etməyən bu yolda,
Dünyavü axirətdə bielmü biəməldir.

Sən canü cümlə aləm işbah imiş məsəldə:
Cansız bədən dirilməz, gör kim, bu nə məsəldir.

Ənbərfəşan saçınla şol günü bulmuşam ki,
Aləmdə adı anın la-ibtida əzəldir.

Çün aləmin Nəsimi qurtuldu kəsrətindən,
Vəhdət kimi bəqası bimüddəti-əcəldir.

Üzün bədri cahanın danəsidir,
Yerü göy, ayü gün pərvanəsidir.

Cahanü dinü dil zülfünə, canım,
Əgər layiq düşər, şükranəsidir.

Üzündür ayətəlkürsi anınçün,
Kəlamüllah məhrəmxanəsidir.

Saçın zəncirinə düşdü bu könlüm,
Müsəlsəl zülfünün divanəsidir.

Qaşınla kirpigin, zülfünlə xalın,
Hərami gözlərin məstanəsidir.

Tutuşmuş eşq odu can ilə cismə,
Bu dərdi kimsə bilməz yanəsidir.

Üzündə abid olmuşdur Nəsimi,
Nəsiminin bu gün cana nəsidir?

Mehri-rüxün tabına düşdü könül yanədir,
Şəm'ə düşən narına yansa gərək, ya nədir?

Ey məhi-bədrin üzü mehri-rüxündən xəcil,
Şəm'inə gör canımı kim, necə pərvanədir?

Zülfü rüxün sirrini bilməyənə aydıram:
Küfr ilə imanımız, Kə'bəvü bütxanədir.

Nəqşi-xəyalın məni nəqşü xəyal eylədi,
Münkiri-eşqin gözü ikiligə yanədir.

Cami-səqahüm içər dilbər əlindən müdam,
Kim ki, anın saqisi nərgisi-məstanədir.

Çünki vüsalınlayam leylü nahar, ey sənəm,
Cami-Cəm uş məndədir, mülki-Süleyman nədir?

Lə'li-ləbinlə gözün mey içirərlər mana,
Mən necə məst olmayam, çün iki peymanədir?

Dünyavü üqbayı mən vəslinə dəyişmişəm,
Assisinə min başım can ilə şükranədir.

Eşqi-rüxün məskəni xəlvətidir könlümün,
Gənci-həyatın yeri gör ki, nə viranədir.

Düşdü Nəsimi saçın həlqeyi-zəncirinə,
Düşməyən ol həlqəyə, gör ki, nə divanədir.

Ümmana girən eşq ilə, dürdanəyə uğrar,
Şükrana verən canını, cananəyə uğrar.

Yanmaqdan əgər qorxur isən şəm’ə yapışma,
Şol atəşi gör kim, necə pərvanəyə uğrar.

Mənsur kimi cuşa gələr, söylər ənəlhəq,
Hər aşiqi-sadiq ki, bu meyxanəyə uğrar.

Getməz dünü gün cami-şərabı nəzərindən,
Hər kimsə ki, şol nərgisi-məstanəyə uğrar.

Təsbih ilə səccadəyi bir cür’əyə satar,
Şol sufiyi-safi ki, bu peymanəyə uğrar.

Əfsanə satar aşiqə əfsun ilə vaiz,
Aşiq qaçan ol qissəvü əfsanəyə uğrar?

Zəncir saçın şöylə dəli qıldı məni kim,
Əqlin itirər kim ki, bu divanəyə uğrar.

Girdi hərəmi-Kə’beyi-təhqiqə Nəsimi,
Hənnanə təvaf eylərü mənnanəyə uğrar.

Sərvin qatında sidrəvü Tuba rəvan olur,
Lə’lin şərabi-kövsərin içən rəvan olur.

Isa ləbin vüsalına irdivü buldu can,
Hər kim ki, bildi ləmyəzəli, cavidan olur.

Ey hürieynə bənzədən ol Isəvi dəmi,
Huri qaçan bu lütf ilə şirinzəban olur?

Eşqin hədisini nə qədər canda gizlədim,
Sirr saxlamaz könül, bu səbəbdən əyan olur.

Hüsnün rümuzunu nə mələk bildi, nə bəşər,
Hər dəgmə canəvərdə qaçan bu bəyan olur?

Nitqin utandırır mələki şol zamanda kim,
Lə’lin hədisə başlarü gövhərfəşan olur.

Mişkin saçınla can ilə sevdaya düşməyən,
Sərmayəsi xəsarətü sudu ziyan olur.

Yaşın niqab içində ki, hüsnündən ey pəri,
Qopar fəğanü fitneyi-axırzaman olur.

Üzündə gərçi ayəti oldu otuz iki,
Hər birisi müvəhhidə yüz min nişan olur.

Hər kim ki, həqqi əhsəni-surətdə görmədi,
Həq ta əbəd anın nəzərindən nihan olur.

Vəslində zində oldu Nəsimi iləl-əbəd,
Abi-həyata vasil olan cavidan olur.

Surətin nəqşində könlüm, ey sənəm, heyran olur,
Bir nəzər görsəm, camalın dərdimə dərman olur.

Kənzi-məxfidir sənin eşqin, yeri viran könül,
Şol cəhətdəndir, şəha, gəncin yeri viran olur.

Leylətül-qədr üştə zülfün, həq kitabıdır üzün,
Qibləsi aşiqlərin bil, surəti-rəhman olur.

Cövrünü hər kimsə çəkdi, lütf anındır bigüman,
Dilbərin cövrü cəfası aşiqə ehsan olur.

Mah-rüxsarın qatında kim ki, səcdə qılmadı,
Divi-məl'undur yəqin, anın adı şeytan olur.

Nəfsini hər kimsə bildi, həqqi bildi bigüman,
Zərxəridə qul isə, aləmlərə sultan olur.

Yar ilə bir ol, Nəsimitək, cahanda fariğ ol,
Kim ki, aldanmaz cahanda, müşkülü asan olur.

Dil sənin şirin kəlamıntək kəlim olmuşdurur,
Can sana bir bəndeyi, əlbət qədim olmuşdurur.

Müshəfi-hüsnündə şol hərfü xətü xalın sənin,
Sətri-bismillahir-rəhmanir-rəhim olmuşdurur.

Istivadan zülfünüz cənnətdə ey huriliqa,
Əhli-imana siratül-müstəqim olmuşdurur.

Nəmdürür eynim bu sevdadan həmişə kim, nədən;
Qaşların nunü dəhanın hərfi-mim olmuşdurur.

Naşüküftə zanbağam, əngüşti-xatəmdir məgər
Kim, fələkdə mahi-bədr andan dü nim olmuşdurur.

Seyyid andan bəlli kim, şaha, qapına yastanır,
Fariğ əz rizvanü bağ, eyşi-nəim olmuşdurur.

Cahan üzün günəşindən münəvvər olmuşdur,
Səba saçın qoxusundan müəttər olmuşdur.

Ləbin qatında ki, andan utandı abi-həyat,
Şəkər sözün nə deyim, çün mükərrər olmuşdur.

Dua ilən nə diləyim səninçün həqdən kim,
Iki cahan sana həqdən müyəssər olmuşdur.

Kimin ki, könlü dilədi ayağını öpmək,
Başını oynamaq ana müqərrər olmuşdur.

Nəsibimi necə sə'y ilə artırım, çünkim,
Əzəldə nəhnü qəsəmna müqəddər olmuşdur.

Səhər yeli əsəli sünbülün diyarından,
Məşami-əhli-məhəbbət müəttər olmuşdur.

Nəsimi, ey şəhi-xuban, camalını görəli,
Gözündə surəti-rəhman müsəvvər olmuşdur.

Ey üzün nuri-təcəlli, mə’niyi-iman budur,
Hər kim iqrar eyləməz, insan degil, heyvan budur.

Sün’ü biçun eylədi zahir üzün, yüz afərin,
Yoxdur anda sirri-peyda, nükteyi-pünhan budur.

Görmüşəm ziba üzünü, surəti-rəhmandurur,
Sormuşam lə’li-ləbini, dərdimə dərman budur.

Leylətül-me’rac zülfün, qabə qövseyndir qaşın,
Hər kişi kim, oldu layiq, eydinə qurban budur.

Surətin lövhündə yazmış nəqşbəndi-kafü nun,
Ayəti-Allahu nurən, höccətü bürhan budur.

Surətin vəchində buldu, bildi arif sirrini,
Bilmədi qafil bu sirri, cahilü nadan budur.

Söylədi zahir Nəsimi şe’rini, verdim cavab:
Ruhi-qüdsü qıldı təhsin, dedi kim, Salman budur.

Gördüm camalın şəm’ini rövşən, məhi-taban budur,
Hüsnün təaləllah dedim, həqdən gələn bürhan budur.

Xızrın həyatı gör necə zülmətdə zahir oldu kim,
Kövsər ləbindir aşiqə, can ilə həm canan budur.

Səcdə edər şəmsü qəmər, Zöhrəvü Mahü Müştəri,
Hüsni-camalın görməgə, hurü mələk, insan budur.

Aşiqlərin rizvanı çün hüsni-rüxündür, ey sənəm,
Ol aşiqi görmə əcəb kim, rövzeyi-rizvan budur.

Zərq əhlidir, yarəb, şəqi kim, tutmamış həq sözünü,
Qılmadı səcdə adəmə, gör kim, bu gün şeytan budur.

Səb’ülməsanidir üzün, inna fətəhnadır xətin,
Əlhəmdülillah, dür dişin, gör mə’dəni-hər kan budur.

Gülbərgi əkdim zülfünə, dağıldı üzün üstünə,
Gül bərgidir bu yasəmən, xalın güli-reyhan, budur.

Qıldı Nəsimi qibləsin şol qaşları mehrabına,
Qövli-Nəsimidir yəqin, ol həq deyən fərman budur.

Məndən üzün yaşırma kim, səcdəgahım oldur,
Seyr edərəm bu çərxi, xurşidü mahım oldur.

Hüsnün çırağın, ey can, pərvanə kimi keçdim,
Tarik içində rövşən göründü, rahım oldur.

Pərhiz edərmi aşiq, ey eşqə münkir olan,
Dersəm ki, tərkini ur, mənim çü şahım oldur.

Kirpiklərinlə qaşın olmuşdur ismi-ə’zəm,
Divdən dəxi nə qorxu, çünkim, pənahım oldur.

Həq də’vidən şəhadət istərlər isə məndən,
Mən onu bulmuşam kim, yenə güvahım oldur.

Ey dünyanın rəisi, mənə həqir baxma,
Mən necə müflis olum, çün izzü cahım oldur.

Sən məndən olma qafil, istə ki, ta biləsən,
Anı ki, tanımışsan, fəzli-ilahım oldur.

Nəsimiyəm ki, düşdüm üzün gülündən ayrı,
Bülbül kimi çəməndə fəryadü ahım oldur.

Eyşü tərəb yari gül, üzar ilə xoşdur,
Canü cahan elə bil ki, yar ilə xoşdur.

Qanıma gəl bandır əlin, ey nigar, gör
Kim, necə simin əlin nigar ilə xoşdur.

Gəldi gül, açıldı lalə, gəl bəri sun cam,
Laləvü gül fəsli-növbahar ilə xoşdur.

Əhli-nəzərdən yaşırma, aç üzünü gəl,
Gül gəlicək əndəlib zar ilə xoşdur.

Dara çıx, ey aşiq, söylə anda ənəlhəq,
Aşiq olanın həqqə başı dar ilə xoşdur.

Aşiqə ol fəxr yetər ki, olmadı sufi,
Dövlət ana kim, bu iftixar ilə xoşdur.

Ta ki, gülünün vəslinə irişməyə hər əl,
Çevrəsi anın həmişə xar ilə xoşdur.

Gərçi xoş olmaz xumarı hər sifətə,
Qəmzeyi-məstanəsi xumar ilə xoşdur.

Aləmi tövhidə çün irişdi Nəsimi,
Nar ilə nur olduvü nur nar ilə xoşdur.

Ey diriğa kim, cahanda yarü həmdəm kəmdürür,
Xubların cövründən özgə kim mənə həmdəmdürür?

Ey günəş üzlü həbibim, şad qılğıl sən məni
Kim, fərağından bu canü dil qəriği-qəmdürür.

Gər inanmazsan ki, qəmzən yıxdı könlüm şəhrini,
Bəs bu fəryadım nədəndir, didə qandan nəmdürür?

Və’deyi qoy, ey könül, gəl bu dəmi xoş görəlim,
Dün ki, keçdi, danla qaib, bəs bu dəm xoş dəmdürür.

Gər desəm vardır cahanda, sənsən, ey könlüm alan,
Dil sənindir, can sənindir, mən mənim bəs nəmdürür?

Zahidin mehrab içində zikrü taətdir işi,
Aşiqin məhbub önündə çəngi zilü bəmdürür.

Bir nəzər qılğıl Nəsimi halına, gör kim, necə
Sözləri fəryadü naliş, gözləri Zəmzəmdürür.

Güli-tərdən gülicək, arizinə ma' tökülür,
Bağa gir, gör ki, necə laleyi-həmra tökülür.

Ənbərin sünbülünə badi-səba kim, iricək,
Qoymağıl titrəməgə, ənbəri-sara tökülür.

Qara saçın ucunu salma ayağına, götür,
Heyf olur nafeyi-tatara ki, hər ca tökülür.

Ləblərindən varalı Misrə xəbər, əttarın,
Qutusundan dünü gün qənd ilə halva tökülür.

Aləmin başına tabəndə üzün şəm'indən,
Xaliqin rəhmətidir, nuri-təcəlla tökülür.

Necə nömid olayım, çün gözümün əbrindən,
Qətrə-qətrə üzümə hər yana dərya tökülür.

Sədəfin gərçi dəhanı doludur inci ilə,
Açıcaq ləblərini, lö'löi-lala tökülür.

Hüsnünün vəsfini ta yazmağa əzm eyləmişəm,
Qələmin dili ucundan qamu sevda tökülür.

Ta cüda düşdü Nəsimi ləbi-lə'lindən anın,
Gözlərindən dünü gün lə'li-müsəffa tökülür.

Ey nəsimi-sübhdəm, billah, şu yarım xoşmudur?
Şol həbibim, dilbərim, aləmdə varım xoşmudur?

Şol mütərra mişki-zülfündən, səba, vergil xəbər,
Şol üzü gül, qaməti sərvü çinarım xoşmudur?

Şol ləbi lə'lü gözü ahuyi-şəhr la dilfirib,
Şol saçı zülmət, bəni mişki-tatarım xoşmudur?

Qönc içində qönçə olub dürc olur dürri-ədən,
Şol çəmən səhnində açılmış baharım xoşmudur?

Yel əlimdə, su gözümdə, od içimdə xak olur,
Daim anda həşr olıcaq səbzəzarım xoşmudur?

Çün Nəsimi saldı özün eşqinə pərvanətək,
Ey üzü gülşən, sana bu ahü zarım xoşmudur?

Sənmisən, ey mahsurət, cənnətin eynində hur,
Gözlərin eyni-bəladır, vəchinin alnında nur?

Ayəti-ərşi-səmadandır lətafət sözlərin,
Dər məani cəm’ qıldı dürri-məknun zühur.

Çeşmeyi-Zəmzəm ləbin, sirri-ələstdir gözlərin,
Kim ola ol kim, qıla mehr ilə vəslinə səbur.

Şübhədən arındı ol kim, qıldı iqrari-səlat,
Ta əbəd məst oldu, içdi cür’eyi-mai təhur.

Kim ki, məhbubun liqasın gördü ol eynəl-yəqin,
Vəchini sürdü turaba, rəbbinə qıldı şəkur.

Kəmtərin oldu Nəsimi fəzli-həqqin çakəri,
Çünki vəslə vasil oldu, eşq ilə buldu hüzur.

Ey üzün şə’nində münzəl ayəti-Allahu nur,
Ləblərin həqqinə gəldi nükteyi-maən-təhur.

Əvvəlü axır çü sənsən, batinü zahir çü sən,
Məqsədi-əqsa camalındır, gözümdən getmə dur.

Söyləyən hər natiqin dilində səndən özgə yox,
Işləyən hər failin fe’lində sənsən biqüsur.

Səndən özgə aradım, dəyyar yoxdur dünyada,
Cümlə əşyada kəmahu eyləyən sənsən zühur.

Zahida, gəl zöhdü mə’bud etmə, olma bütpərəst,
Həqpərəst ol, həqqi tanı, həq-minəllahül-ğəyur.

Aşiqin məqsudu didarındır, ey arami-can,
Qeyri-didarın görünməz gözümə cənnatü hur.

Vaqif olmaz sirri-lövhidə ol iman əhli kim,
Edə bilməz nəfsini dünya həvasından übur.

Aləmi-ərvaha, ey dil mürğü, pərvaz eylə kim,
Qalmadı bu aləmi-ünsürdə bir saət hüzur.

Ey Nəsimi, surü e’cazi-Məsihadır sözün,
Istimaından nola həyy olalar min-fi-qübur.

Qara saçın ki, zülmatındadur nur,
Anın adıdurur nurən-ə’lanur.

Yanağından əyan oldu ənəlhəq,
Qaçan surət olar güzgüdə məstur.

Nəzirin yoxdur, ey dilbər, nəzirin,
Zəhi sahibnəzər pakizəmənzur.

Mana məqsud iki aləmdə sənsən
Ki, sənsən cənnətü cənnətdəki hur.

Nə meydən əsrimiş nərgislərin kim,
Məni əndişəsindən qıldı məxmur.

Nə müshəfdür ki, hüsnün ayətini
Bəyan etdikcə əql andan düşər dur?

Vüsalın cavidani səltənətdir,
Bu dövlət olmadı hər şaha məqdur.

Gəl, ey sultani-aləm, arif ol kim,
Məlik mə’nidə arifdir, nə fəğfur.

Əgər nuş istər isən nişə qatlan
Ki, nuşu nişsiz verməz bu zənbur.

Nə qeyrətli ənəlhəqdir bu, yarəb,
Ki, Mənsuru asar darına mənsur.

Çıxar pənbə qulağından, gözün aç
Ki, həşr olduvü çalındı bu gün sur.

Ləbin lə'li-Bədəxşan eylədi mat,
Həbəş mülkündə xalın asdı mənşur.

Nəsimi çünki həqqə vasil oldu,
Gərək matəm tut, ey münkir, gərək sur.

Niqabı üzündən götürdü qəmər,
Utandı ləbindən nabatü şəkər.

Təbarəktə, ey həq sifətli nigar,
Təaleytə, ey həq sifətli bəşər.

Saçın şərhini eylərəm hər gecə,
Üzün vəsfini söylərəm hər səhər.

Əsir olmayan hüsnünə adəmi,
Həcərdir, həcərdir, həcərdir, həcər.

Gəl, ey tacir, uş Yusifi satın al
Ki, kanında qiymətsiz olur göhər.

Qılından belin incə gördüm tamam,
Vəli incədən incədir bu xəbər.

Boyun ənbətəllah, zəhi e'tidal,
Gözün eynəkəllah, zəhi xoş nəzər.

Sözün abi-heyvandır, ağzın rəhiq,
Bu vəsfi-əzim, eylərəm müxtəsər.

Gəl, ey sidrətül-müntəha kim, boyun
Mübarək şəcərdir, mübarək şəcər.

Çü ə'lavü əsfəldə gördüm səni,
Nə qəm, gər cahan olsa zirü zəbər.

Həqqi gör, həqqi bil, həqqi tanı kim
Ki, həqdən doludur yedi bəhrü bər.

Zühur eylədi cümlə əşyada həq,
Qanı bir bəsirətli, açıqnəzər.

Nəsimi kimi vahid ol yarilən,
Ikilik sifətdən ikilik bitər.

Ikilikdə qalan əzazil olur,
Mələksiyrət insan ol anı gidər.

Sünbülün əbrində gördüm uş məhi-taban gəlir,
Saçların hər tarəsindən şö'leyi-iman gəlir.

Surətin əşkalıdır inna fətəhna, ey nigar
Kim, bu eşqin ayətində həqqə uş bürhan gəlir.

Zülmətin dövranı keçdi, oldu ol Xızr aşikar,
Şimdi sordum, ləblərindən çeşmeyi-heyvan gəlir.

Gərçi ehsan etdiyin daim vəfadır aşiqə,
Sən vəfalısan, vəfa qıl kim, cəfa çəndan gəlir.

Razımı faş etdi ahım, şol səbəbdən, ey nigar,
Vəslinə vəsl olmağa çün dəğmə hər nadan gəlir.

Lövhi-məhfuz oldu qaşın, kirpigin eşq əhlinə,
Surətin lövhündə, ey can, həq dedi Fürqan gəlir.

Gül yanağın həsrətindən bülbül, ey can aşiqi,
Ah edər gül həsrətindən, biləməz xəndan gəlir.

Əhsəni-təqvimə çün səcdə qılır hurü mələk,
Surətin gördü məgər kim, səcdəyə şeytan gəlir.

Çün məqami-dilbər oldu, ey Nəsimi, aşikar,
Şol həyati-cavidan buldu, yeri cinan gəlir.

Dodağın qənd imiş, bal anda neylər?
Nə nazik xətt imiş, xal anda neylər?

Yedi hərf oldu çün hər bir vərəqdə,
Əlif ya lam əlif dal anda neylər?

Sufi ətləs geyər, zahid səqərlat,
Fəqirin geydiyi şal anda neylər?

Kimin ki yoxdurur gənci-nihanı,
Ya anca mülk ilə mal anda neylər?

Nəsimi nara düşdü yar əlindən,
Bu özgə hal imiş, qal anda neylər?

Rüxün bədridürür şəm’i-münəvvər,
Təaləllah, zəhi pakizə cövhər!

Səkiz qapısıdır cənnati-ədnin,
Qaşınla kirpiyin, zülfün müənbər.

Ələm nəşrəh saçın, vəş-şəms alnın,
Boyun Tuba, ləbindir abi-kövsər.

Əyan oldu ləbin eynində şol su
Ki, qərq oldu cahan bəhrində yeksər.

Tənin tinindən oldu xəlq ərvah,
Təaləllah, zəhi pakizə gövhər.

Sücud eylər rüxü zülfün qatında,
Məh ilə əncümü xurşidi-xavər.

Rümuzun bilməyən Beytül-həramın,
Nə bilsin ki, nədir mehrabü minbər.

Fələk hüsnündə heyrandır, mələk mat,
Nə dəryasan, nə mə’dənsən, nə gövhər?

Sərasər nuri-mütləqdir vücudun,
Nə mahiyyətsən, ey zati-mütəhhər?

Məgər şəm’i-təcəllidir camalın
Ki, nurundan cahan oldu münəvvər?

Nəsiminin sözü həqdir, həqi bil
Ki, həqdir hər nə kim, dilində söylər.

Dilbəra, eşqində aləm sərbəsər qovğa çəkər,
Sanma ki, eşqin bəlasın mən qulun tənha çəkər.

Gər sana təqrir edəm şərhi-dərunum şəmməsin,
Bazuyi-himmət qələm bər-kuhü ba-səhra çəkər.

Aşiqi-həqbin qılır yarın tamaşasın bu gün,
Zahidi-xudbin durubdur qüsseyi-fərda çəkər.

Sübhi-vəslindən camalın afitabın görməyə,
Gözlərim ta sübhdəm bidariyi-şəbha çəkər.

Ey Nəsimi, yarın əsmasın dilindən qoymagil
Kim, müsəmmaya səni xasiyyəti-əsma çəkər.

Bu gün ol şahidin şəkli qamundan ixtiyarımdır,
Ümidimdir, ümidgahım, vəfalı, doğru yarımdır.

Həbibimdir, təbibimdir, gülümdür, əndəlibimdir,
Rəfiqimdir, şəfiqimdir, qəmimdir, qəmgüsarımdır.

Vücudumdur, rəvanımdır, damarımdakı qanımdır,
Bu gün şahi-cahanımdır, lətafətli nigarımdır.

Əzizim, nuri-didəmdir, dü aləmdə güzidəmdir,
Saçı bəxti-rəmidəmdir, yanaqları ənarımdır.

Gülü reyhanü laləmdir, meyü sağər, piyaləmdir,
Gülüstanü kəlaləmdir, müzəyyən növbaharımdır.

Könül yəğma qılanımdır, məni dərdə salanımdır,
Genə dərman qılanımdır, əvan tülki-tatarımdır.

Sərəfrazım, həbibimdir, bu dərdimə təbibimdir,
Bu gün yari-qədimimdir, cahanda iftixarımdır.

Üzü nuri-ilahımdır, münəvvər şəmsü mahımdır,
Könül təxtində şahımdır ki, zirək şəhriyarımdır.

Boyu sərvi-çinarımdır, saçı mişki-tatarımdır,
Əcəb şirin nigarımdır, gülüstani-baharımdır.

Şərabımdırü şəhdimdir, bu gün novruzi-eydimdir,
Mənim bəxti-səidimdir, behişti-gülüzarımdır.

Xəyalımdır ki, fikrimdir, namazımdır ki, zikrimdir,
Dodağı qəndi-Misrimdir, mükərrər şəhdü barımdır.

Cimim, mimim, hürufumdur, xubəxlaqü lətifimdir,
Güləndamım, zərifimdir, gülümdür, gülüzarımdır.

Nəsimini bu gün, yarəb, əcəb yad eyləmiş dilbər:
Həqirimdir, fəqirimdir, qəribü dilfikarımdır.

Ey müsəlmanlar, mədəd, ol yar pünhan ayrılır,
Ağlamayım neyləyim, çün gövdədən can ayrılır.

Ey sənəm, hicran əlində naleyi-zar eylərəm,
Gözlərimdən sanasan dəryayi-ümman ayrılır.

Ol səbəbdəndir ki, mən bimarü rəncur olmuşam,
Xəstə könlüm mərhəmi, şol dərdə dərman ayrılır.

Rəngi-çöhrəm zərd olubdur, qamətim həm çün hilal,
Ol günəş üzlü həbibim, lə'li-xəndan ayrılır.

Taqətim, səbrim tükəndi, yarsız mən neylərəm?
Əqlimi şeyda qılan ol çeşmi fəttan ayrılır.

Məhşəri-yövmül-hesab, qopdu qiyamət başıma,
Ey Yusuf surətli, məndən piri-Kən'an ayrılır.

Ey cigərsuz nari-firqətdən Nəsimi çarə nə?
Hər kimə nəhnü qəsəmna çün əzəldən ayrılır.

Camalın təl’əti gülzara bənzər,
Dodağın şərbəti xunxara bənzər.

Nəimin bağıdır gülzari-vəehin,
Əgər odlu üzün gülnara bənzər.

Tamaşayi-camalın qulhüvəllah,
Üzündən qılmayan hüccara bənzər.

Yanağın cənnətin xəndan gülüdür,
Vəli nərgislərin əyyara bənzər.

Vücudun Misri-came’dir, saçın Şam,
Xorasanü Əcəm, Bulqara bənzər.

Mənəm əxtər bu Misrü Şam içində,
Kəvakib türrəsi timara bənzər.

Nəsiminin vücudu, ya Məhəmməd,
Anadır daima iqrara bənzər.

Şəha, çün surətin Fürqanımızdır,
Ol on dörd xət bizim Qur'anımızdır.

Qaşınla kirpigin, zülfün səvadı,
Dəlilü höccətü bürhanımızdır.

Sifatinda müənbər küfri-zülfün,
Bəyazi-vəch ilə imanımızdır.

Rüxün lövhündəki on altı xəttin
Ələl-ərş üstüva rəhmanımızdır.

Necə tərkini qılsın can sənin kim,
Əzəldən çün ki, canın canımızdır.

Gəl, ey dərviş olan dövri-qəmərdə
Sürək dövran ki, xoş dövranımızdır.

Bu gün çün eydi-əkbərdir camalın,
Nəsiminin canı qurbanımızdır.

Üzündür Turi-Sina, rəqqi-mənşur,
Bilindi üştə gör nuri-əla-nur.

Qaşındır qabə qövseyn, sidrə boyun,
Qatında cənnətü rizvan, həm hur.

Üzün darüssəlam oldu, səlamın
Yeridir Kə’bəvü həm beyti-mə’mur.

Anın şə’nindədir fəthi-qərib həm,
Kəlam içində gör bu sətri məstur.

Qara çeşmindədir dövrani-aləm
Ki, oldur cümlə əşya üstə mənzur.

Qiyamət qamətindən oldu zahir,
Yəqin bu, qəddin üçün oldu məqdur.

Qamu əşyada sənsən qadirü şah,
Qulundur qeysərü xaqanü fəğfur.

Sənin nitqindən oldu zində əşya,
Bilindi həşrü nəşrü nəfxeyi-sur.

Çü natiqdir kəlami-həq üzündən,
Görün bu sirri-pünhan oldu məşhur.

Nəsimidir əzəl canan əlindən
Şərabi-kövsər içdi əz ləbi-hur.

Apardı könlümü bir çeşmi-məxmur,
Kim ola istəməz ol hüsnə məğrur.

Şərabi-lə’linizdən cür’ə içdi,
Ənəlhəq çağırır eşqində Mənsur.

Həqin əsrarını mən anda gördüm
Ki, Musa söylər idi bər-səri-Tur.

Sənin eşqində, ey Leylisifətli
Ki, Məcnun olmuşam aləmdə məşhur.

Çü Isa nöh fələk çərxinə çıxdım,
Cahanı sərtasər gördüm pür əz nur.

Nəsiminin cahanda yarı sənsən
Ki, sənsən cənnətü cənnətdəki hur.

Kim aydır kim, üzün gülnara bənzər?
Ki, üzün nurəvü gül nara bənzər.

Yanağın cənnətin xəndan gülüdür,
Vəli anın fəraqı xara bənzər.

Süzülmüş gözlərin sağü səlamət,
Vəleykin baxışı bimara bənzər.

Saçın buyu Məsihanın dəmidir,
Kim aydır nafeyi-tatara bənzər?

Nə gündür, yarəb, ey dilbər, camalın
Ki, axşamı anın ənvara bənzər.

Sana bənzər cahanda kimsə yoxdur,
Məgər huri kim, ol bir para bənzər.

Saçın əsrarını zahid nə bilsin
Ki, təsbihi anın zünnara bənzər.

Əgərçi qaşlarındır fitnə başı,
Hərami gözlərin əyyara bənzər.

Fəqih adəmdən ürkər, səcdə qılmaz,
Bu divin xilqəti əmmara bənzər.

Gəl ey sufi vü tərk eylə bu sehri
Ki, Musanın əsası mara bənzər.

Günəş bənzər dedim, şol aya, heyhat,
Qaçan şol maha hər səyyarə bənzər?

Məhəbbət möhkəm işdir, qafil olma,
Bu karı sanma ki, hər kara bənzər.

Səfasız sufi daim qayğuludur,
Bu mə’nidən ki, butimara bənzər.

Nəsimi küntə kənzin gövhəridir,
Hədisi lö’löi-şəhvara bənzər.

Üzün nuri-təcəlli məzhəridir,
Sözün dadlısı abi-kövsəridir.

Rüxün şəm'i şüasından nünəvvər,
Fələkdə mahü mehrü Müştəridir.

Gözün sehrindən ol Harutü Marut,
Asılmış Çahi-Babildə, yeridir.

Fələklər üz sürərlər ayağına,
Mələklər xidmətində çakəridir.

Əzazil qaçdı vəslin qürbətindən,
Anınçün tövqi-lə'nət zivəridir.

Sədəfdir cümlə məxluqun vücudu,
Vücudun ol sədəflər gövhəridir.

Dəmi-Isa ölü dirildər, amma
Dəmindən Xızr ilə Isa diridir.

Camalın mö'mini mö'minə mir'at
Ki, daim mö'minin ol mənzəridir.

Nəsimi gövhəridir bəhri-eşqin,
Bu bəhrə dalmayan divü pəridir.

Şəm'i-fələk hüsnünə pərvanədir,
Canü cahan vəslinə şükranədir.

Çəkdi saçın könlümü zəncirinə,
Şol dəliyi gör ki, nə divanədir.

Nərgisi-məstin olalı meyfüruş,
Guşənişinin yeri meyxanədir.

Lə'li-ləbin rihi-müsəffasına,
Ruhi-müqəddəs kiçi peymanədir.

Türrələrin fikrinə düşdü könül,
Fikrini gör kim, nə pərişanədir?

Batini mə'mur olanın batini
Eşqi-rüxün gəncinə viranədir.

Ey ləbü dəndanına olmuş tüfeyl,
Qandakı bir lə'l ilə dürdanədir?

Şəm'ə deyən razını pərvanənin,
Çarəsi yanmaqdır anın, ya nədir?

Çəkdi saçın dama məni xal ilə,
Xalını gör kim, nə bəla danədir.

Kim ki, camalın sifətin söyləməz,
Söylədiyi qissəvü əfsanədir.

Eşqə Nəsimi verəli canını,
Həq bilir anı ki, nə canənədir.

Müənbər sünbülün, şaha, güli-siraba pürçindir,
Məazallah, xəta qıldım, nə pürçin, nafeyi-Çindir.

Xətadır Çinə həml etmək müənbər zülfünü, billah
Ki, hər bir qılı saçının həzaran Çinü Maçindir.

Dəhanından xəbər verdi rəvanpərvər sözün, amma
Bilinməz nəsnədən kimsə inanmaz kim, xəbər çindir.

Sən ol sultani-xubansan bu gün aləmdə, ey dilbər
Ki, qultək cümlə sultanlar sana şahinü laçindir.

Müdəvvər nöqteyi-xalın gözümdən bir nəfəs getməz,
Məgər kim, şol qara bənlər gözümdə nəqşi-pürçindir.

Rüxün üzrə bənin şahanə hindudur, əcəb, yarəb,
Yalançı oğrumu, yaxud Irəm bağında gülçindir?

Göyərçintək şikar etdi məni ol nərgisi-fəttan,
Yavuz gözdən iraq olsun ki, xoş türkanə laçindir.

Məhi-tabana, ya mehrə səni bənzətməsəm, neyçün
Ki, hüsnün xirmənində gün məh ilə sünbüləçindir.

Gözümdən gərçi dilkəşdir saçının şivəsi, amma
Nəsimiyi bu sevdaya buraxan şol moğolçindir.

Gözümdən dəmbədəm axan qəmindən su degil, qandır,
Ləbin qəndindən, ey can, gəl susamış canımı qandır.

Vücudum şəhrini qıldı müsəxxər ləmyəzəl eşqin,
Bu şəhristanda eşq olsun məlik daim ki, xaqandır.

Qaşınla kirpigin vəhyi mana gəldivü bildirdi
Ki, sənsən ərş ilə kürsü, üzün yazısı Qur'andır.

Gəl, ey hurisifət dilbər ki, qəmdən bağrımın içi
Səba ol qönçəyə bənzər kim, ağzı dopdulu qandır.

Ənəllahın odundan kim, yanağın şəm'i yandırdı,
Ləbi-lə'lindən afaqı həyatın abına qandır.

Rüxün şəm'i fəraqından könül pərvanətək yandı,
Ulaşdır vəslə hicranı, həsudun bağrını yandır.

Sana huri əgər bir gəz qılırsa hüsnünü ərzə,
Rüxün bədrin əyan eylə, üzündən anı utandır.

Camalın vəslinə canım susadı, yürəgim yandı,
Könül hicrindən usandı, məni hicrindən usandır.

Xəyalın gərçi şad eylər məni hər gah, gah amma,
Fəraqın qüssəsin gör kim, necə bihəddü payandır.

Fərağından axan yaşım məni qərq eylədi suya,
Gözümdən yaşımı gör kim, nə seyl axır, nə tufandır.

Nəsimidən cüda yarı qılan həqdən cüda olsun
Ki, yarından cüda yarı qılan bidinü imandır.

Sənsiz nə yesəm, qüssəvü qəm, dərd ilə qandır,
Gəlgil, dodağın şərbətinə canımı qandır.

Vəslindən iraq eyləyəli canımı təqdir,
Işim dünü gün ah ilə fəryadü fəğandır.

Ey sərvi-rəvan, başıma lütf eylə, qədəm bas,
Gör kim necə eynindən iki çeşmə rəvandır.

Vəslin dilərəm, canü cahan olmasa qəm yox!
Aşiqlərinə vəsli-rüxün canü cahandır.

Bürqə götür, ey şəmsü qəmərçöhrəli, xəlqi
Pərvanə kimi şəm'i-rüxün nüruna yandır.

Ey xirqə geyən yol urucu zahidi-salus,
Şirkindən arın, xirqəni gəl vəhdətə bandır.

Zülfünlə rüxün, hər necə kim, müshəfə baxdım,
Gördüm ki, anın surələri nurü duxandır.

Təhqiqə irən taifəyə hərgiz ulaşmaz,
Təşkiklə qalanın işi təqlidü gümandır.

Yalançı münafiqdir, anın yoxdur imanı,
Ey qafil, oyan, könlünü qəflətdən oyandır!

Ey aşiqə kafir deyən, imana gəl, utan,
Kafir demə aşiqlərə niçün ki, yalandır.

Eşqində Nəsimi olalı xalqa məlamət,
Məşhuri-cahan olduğu aləmdə əyandır.

Ey ləbin eyni-abi-heyvandır,
Xızra sor anı gör ki, nə candır.

Nə şirindir dodağının zövqü,
Ol səbəbdən ki, lə'lü mərcandır.

Həq əyan eylədi üzündə bu gün
Şu hürufu ki, hərfi-bürhandır.

Səni kimdir ki, fərq edər həqdən,
Məgər ol laşəyi ki, nadandır.

Şəm'i-rüxsarının təcəllisi
Yenə doğdu ki, mahi-tabandır.

Hüsnünə səcdə qılmayana sənin,
Həq dedi adını ki, şeytandır.

Əyyuhənnas əlləməl-Qur'an,
Üzü təfsirdir, bu, Qur'andır.

Küntə kənzi bizə bəyan elyər,
Bilirəm kim, nə gənci-pünhandır.

Eydi-əkbərdürür, Nəsimi, gəl
Qıl fəda canını ki, qurbandır.

Ey rüxün gülzari-cənnət, saçların reyhanıdır,
Ey dodağın abi-heyvan can anın heyranıdır.

Surətin lövhündə həq çəkmiş kəmali-qüdrətin,
Əhsən, ey surət, kəmahı qüdrəti-rəhmanidir.

Gəl ki, yandırdı məni hicrində eşqin atəşi,
Şərbəti-vəslin bu dərdli xəstənin dərmanıdır.

Mö'minin qəlbindədir əhli-yəqinin rövzəsi,
Arifi-əsrari-həq şol rövzənin rizvanıdır.

Ey ki, hüsnündür kəmali-qüdrəti-rəhmanımız,
Qüdrəti-rəhmana heyran olmayan şeytanidir.

Dilbərin yolunda sən gər əhl olursan, can fəda
Tərki-can etmək yolunda ömri-cavidanidir.

Ey Nəsimi, həq sənə oldu çü Fəzli-müstəan,
Şükri-əyyami-vüsalü rəhməti-rəhmanidir.

Canımın, cana, vüsalın can içində canıdır,
Cana canü cana canü canü həm cananıdır.

Yarəb, ey sərvi-rəvan, hüsnün nə gülşəndir kim, ol
Bülbüli-ruhül-əminin bağı həm bostanıdır.

Qamətin, yarəb, nə tubadır, nə cənnətdir üzün
Kim, yəqin əhli-behiştin rövzeyi-rizvanıdır.

Bəxtili Xızr imiş, ol dövlətligün, fərxəndəfal
Kim, dodağın səlsəbili çeşmeyi-heyvanıdır.

Gözlərin dövründə düşdü qülqülə aləmdə çün,
Sürsün ol dövranı kim, dövran anın dövranıdır.

Bəhri-eşqində Nəsimi gör necə qəvvasdır,
Gövhəri-yekdanə buldu, bəhri-bipayanıdır.

Ləbinə əhli-nəzər çeşmeyi-heyvan dedilər,
Gərçi uçmaq hurusu cümlə ana can dedilər.

Səni bu hüsni-camal ilə, bu lütf ilə görən,
Qorxdular həq deməgə, döndülər insan dedilər.

Surətin vəsfini sordum isə hər taifədən,
Mə'ninin güzgüsünü surəti-rəhman dedilər.

Sunbülün halı pərişan, dedilər, hal əhli,
Allah-Allah, nə üçün, mişkə pərişan dedilər?

Bir qılın qiymətini hər kimə sordumsa, ana
Gənci-Qarun ilə min mülki-Süleyman dedilər.

Düşmənin adını aşiqlərə sordum ki, nədir,
Eşidən cümlə nə kafər, nə müsəlman dedilər.

Şək degil kim, üzünü görməmiş anlar ki, səni
Huriyə bənzədübən Yusifi-Kən'an dedilər.

Ləblərin vəslinə irmək mana müşkül görünür,
Gərçi sordular anı, dil ilə asan dedilər.

Ağzın əsrarına əndişə qaçan vaqif ola
Ki, üqul əhli ana nükteyi-pünhan dedilər.

Ey Nəsimi, dəmi-Isa degil isə nəfəsin,
Nəfəsi doğrular ana nə üçün can dedilər?

Dişlərin nəzminə dürdaneyi-gövhər dedilər,
Göricək üzünü xalq, ayəti-əkbər dedilər.

Yazıcaq surətini müxtəreyi-nəqşi-vücud,
Yerü gög xalqı ana ruhi-müsəvvər dedilər.

Kirpigindən dilədim könlümü, qaşınla gözün
Qoymadı bizdə anı zülfi-müənbər, dedilər.

Sordum ərvaha üzün vəsfini hərfən-hərfa,
Kimsənin şərhinə gəlməz bu güli-tər dedilər.

Ləbini canlara sordum ki, nədəndir əsli,
Ruhi-qüdsi dəm ilə, nuri-mütəhhər dedilər.

Gərçi sərfitnə saçındır qəmərin dövründə,
Fitnənin mərkəzi şol xali-müdəvvər dedilər.

Gər desəm zülfünə mürsəl, nə əcəb, ya hadi,
Mö'cüzat əhlinə hadiyü peyəmbər dedilər.

Gərçi zülmata saçın dalıdır, ey fitnə, dəlil;
Aşiqə şəm'i-rüxün nurunu rəhbər dedilər.

Rövşən oldu yerü gög mehri-rüxün nurundan,
Bu cəhətdən üzünə mehri-münəvvər dedilər.

Gülə əl sunmasın ol kim, tikənindən üşənür
Kim, bu həmra gülünün xarına xəncər dedilər.

Dedilər qəndü şəkər lə'linə, yarəb, nə üçün
Kövsərin şərbətinə qənd ilə şəkkər dedilər.

Cənnətin xəmri ləbin rahıdır, ol mə'nidən
Səlsəbil oldu ləbin, adına kövsər dedilər.

Sana günəş kimi, ey fitnə, sücud eyləyənin,
Əxtərü taleyi məs'udü müzəffər dedilər.

Ey Nəsimi, nədir ayrux diləyin həqdən kim,
Nə ki həqdən dilədin, oldu müyəssər, dedilər.

Dodağın qəndinə şəkər dedilər,
Cani-şirinə gör nələr dedilər?

Dedilər kim, dəhanı yoxdur anın,
Bixəbərlər əcəb xəbər dedilər.

Can demişlər dodağına, hey-hey,
Bu sözü gör nə müxtəsər dedilər.

Şama bənzətdilər qara saçını,
Arizin nuruna səhər dedilər.

Əhli-mə'ni xücəstə surətinə
Mə'niyi-vahidüssüvər dedilər.

Ənbərəfşan saçınla arizinə
Yasəmin üzrə müşki-tər dedilər.

Şəbi-yeldadurur saçın gecəsi,
Surətin bədrinə qəmər dedilər.

Kirpigin oxuna, qaşın yayına
Aşiqin sinəsin sipər dedilər.

Bax anın üzünə, Allahını gör,
Əhli-mə'ni budur nəzər dedilər.

Həqdən olmuş irağ anlar kim,
Səni, ey nuri-həq, bəşər dedilər.

Ey Nəsimi, mühiti-ə'zəmsən,
Gərçi əlfazına göhər dedilər.

Saçının şəbində üzü iki həftəlik qəmərdir,
Bu sözü bilən bilür kim, bu nəzər necə nəzərdir.

Qara zülfünü rüx üzrə görəli gözüm nigarın,
Dün ilə günün həmişə qamu şam ilə səhərdir.

Ləbinin ki, can şərabı utanır həlavətindən,
Şəkkərə qılan müşabeh, gözü bağlı bibəsərdir.

Iki aləmin vücudu ayağın tozuna dəgməz,
Bu sədəfdə kim bilir kim, bu nə qiyməti göhərdir?

Bu camalü hüsnü gör kim, urar aya tə’nə, yarəb,
Bu nə həq surətli adəm, bu nə mə’nilü bəşərdir?

Gözəlin üzünə baxmaq diləməz fəqihü sufi,
Gözü görməzin nəsibi bu günəşdən ol qədərdir.

Gül əgərçi xubü tazə görünür nəzərdə, lakin
Gəl anın yanağı gör kim, əbədi lətifü tərdir.

Dodağı, gözüdür anın əbədi şərabü noğlum,
Bu nə badeyi-səqahüm, bu nə qəndü gülşəkərdir?

Yanağı, ləbi qəmindən necə sayru olmayım mən,
Dəgirən mana şəfayı, bu gül ilə ol şəkərdir.

Irəmin gülü qurutdu qanını tənində hüsnün,
Bu siminbərin üzün gör ki, necə lətifü tərdir.

Günəşindən uş yanağın cigərim tutuşdu yanar,
Nə bilir bu halı şol kim, qaragünlü bicigərdir.

Xəbəri bilən xəbirin xəbəri özündən olmaz,
Nə derəm sana eşit kim, bu xəbər əcəb xəbərdir.

Ənə rəbbiküm oduna necə yanmasın Nəsimi,
Bu ənəlhəqin çırağı əbədi çü yanəsərdir.

Tabəndə üzün təl’əti xurşidi-taban göstərir,
Şol sidreyi-ə’layı gör, sərvi-xuraman göstərir.

Üzün rümuzu şərh edər inna fətəhna, ey nigar,
Kim, vəhyi-mütləq sirrini aləmdə pünhan göstərir.

Cami-ələl-ərş istiva rəhmanı həqdən buldum uş,
Ol mə’nindən həq daima mö’cüzü bürhan göstərir.

Yaxdı fəraqın uş məni sər ta qədəm Musa kimi,
Firqətdə yanan aşiqə gör kim, nə hicran göstərir.

Lö’löi-nabın vəsfini axıtdı qəmdən gözlərim,
Gör kim, necə hər qətrəsi dəryayi-ümman göstərir.

Rüxsarın üzrə zülfünü dağıtma nəsrin üzrə kim,
Zülfi-siyahın gör necə küfr ilə iman göstərir.

Gərçi dodağın vəsfini sordum mən anı arifə,
Lə’lin şərabı Xızra gör nə abi-heyvan göstərir.

Oldu xəyalından zəif cismi Nəsiminin, yenə
Dərmanı səndədir, şəha, kimdir ki, dərman göstərir?

Sünbülün əbrində üzün mahi-taban göstərir,
Kafiri islama çəkmiş küfrə iman göstərir.

Surətindən kəşf olur çün sureyi-ümmül-kitab,
Vəhyi-mütləq sirrini aləmdə pünhan göstərir.

Firqətin dövranı keçdi, getdi zülmət aradan,
Çün əyan oldu ləbindən k'abi-heyvan göstərir.

Gözlərim yarın qəmindən axıdar dürdanəyi,
Şol səbəbdən ləblərində lə'lü mərcan göstərir.

Gər ənəlhəq sirrini faş eyləyim həqdən bu gün
Kim, məni şövqündə yaxar dəxi hicran göstərir.

Dərdimin dərmanı sənsən, bilmədim, sordum təbib,
Çün yəqin sənsən dəvası, dərdə dərman göstərir.

Zülfü rüxsarın Nəsimi sirrini faş eylədi
Kim, bu əsrarın bəyanı ərşi-rəhman göstərir.

Zülfi-dütası şahımın həlqəsi mah içindədir,
Şol qəmərin mənazili əbri-siyah içindədir.

Düşdü kəməndi-zülfünə əqlü rəvan quşu, vəli
Zilli-ilaha yapışan zilli-ilah içindədir.

Kə'beyi-eşqə varanın sidqi niyaz olur, vəli
Mənzilə aqibət irər, kim ki, bu rah içindədir.

Canımı bir nigah ilən aldı hərami gözlərin,
Gör ki, nə dürlü fitnələr uşbu nigah içindədir.

Aləm içində bigüman, sənsən əmiri-dilbəran,
Gör ki, bu rəsmə padişah qanğı sipah içindədir?

Sərvi qəbada ya məhi kimsə külahda görmədi,
Şol boyu sərvi gör necə mahı külah içindədir.

Surəti-xuba müddəi, baxma demiş Nəsimiyə,
Üzü qarayı gör necə küfrü günah içindədir.

Dərdü fəraqə düşdü can, ahü fəğan içindədir,
Sən bu əzabü atəşi gör ki, bu can içindədir.

Şövqə buraxma könlümü, çün sana rövşən oldu kim,
Necə qəm ilə, hüznilə dərdi-nihan içindədir.

Vəsli-rüxündən özgə mən kövnü məkana baxmazam,
Gərçi xücəstə vüslətin kövnü məkan içindədir.

Eynim içində qamətin sidrəsi məskən eylədi,
Sidrə həm anda yaraşır k'abi-rəvan içindədir.

Çərxə çıxardı ahımı, canımı yandırır qəmin,
Gör necə nar imiş qəmin kim, bu düxan içindədir.

Yarımı məndən ayıran hacəti hasil olmasın,
Assı sanan bu işi gör kim, nə ziyan içindədir.

Səndən əgərçi düşmüşəm ayru, səninləyəm yəqin,
Ol nə bilir bu rəmzi kim, zənnü güman içindədir.

Halımı sənsiz, ey sənəm, bilməz isən, gəl üştə gör,
Könlümə baxü bağrımı gör ki, nə qan içindədir.

Vəsli-rüxün bahasına versəm əgər ucuz ola!
Canü cahanü hər nə kim, iki cahan içindədir.

Silsiləsində zülfünün can vətən eylədi neçün,
Yə'ni ki, canımın yeri səhni-cinan içindədir.

Oldu Nəsimi, ey qəmər, hüsnünə fitnə, neyləsin
Fitneyi-axirəzzaman çün bu zaman içindədir.

Vəslinə kim ki irmədi, dərdü əzab içindədir,
Lə'lini kim ki sormadı, təşnə sərab içindədir.

Könlüm içində surətin can kimi qılmışam yerin,
Gövhəri-küntü-kənzi gör kim, nə xərab içindədir.

Şəm'i-rüxün hərarəti cuşə gətirdi aləmi,
Gör necə yanar od imiş kim, bu kabab içindədir.

Qəndü nabatü şəkkərin ləzzətini unutmuşam,
Ta ki, bənimlə ləblərin nazü itab içindədir.

Kim ki qaşınla olmadı sübhi-əzəldə aşina,
Ta əbəd ol qaragünün bəxti səhab içindədir.

Sirri-səqahüm rəbbihüm zahidə sorma kim, anı
Arifi-rəbbihüm bilir kim, bu şərab içindədir.

Zöhdə dəlalət eylərəm, eşqə həris olur könül,
Mən nə şümara düşmüşəm, ol nə hesab içindədir.

Düşdü cahana qülqülə fitnəli nərgisindən uş,
Fitnələrin gör, anı sən sanma ki, xab içindədir.

Şəmsü qəmər əgər üzün tabına düşmədi, nədən
Eşqə əsir olan kişi atəşü ab içindədir.

Surətinin sifatına valehü heyran olmuşam,
Gözdən əgərçi surətin tərfi-niqab içindədir.

Zülfü qaşın Nəsimiyə vəchi-həsəndir, ey sənəm,
Cim ilə nun bu hüsn ilə qansı kitab içindədir?

Hər kim irər vüsalına, eyşi-nəim içindədir,
Vəslinə irməyən kişi bil ki, cəhim içindədir.

Zülməti-hicrü firqətin misli-cəhənnəm atəşi,
Müntəzir ali vəslinə nuri-əzim içindədir.

Abi-həyata irişən buldu həyati-cavidan,
Zülmət içində qalanı əzmi-rəmim içindədir.

Çün gedə ortadan hicab, eynə mübəddəl ola elm,
Bilinə anda kim, kimin qəlbi səlim içindədir.

Buldu səlamət ol kişi kim, tələbi vüsal idi,
Istəməyən səlaməti rəncü əlim içindədir.

Surəti-xuba müddəi baxma deyib haram edər,
Üzüqara yəhudu gör, küfri-səqim içindədir.

Buldu bu gün vüsalını eşq ilə uş Nəsimi kim,
Vəslinə vasil olanın eyşi müqim içindədir.

Leylətül-qədrin səvadı zülfi-pürtabındadır,
Vəzzühanın afitabı üzü məhtabındadır.

Ey xumarlı gözlərində fitnəyi uyur sanan,
Gözləri şol fitnədir kim, fitnəsi xabındadır.

Zülhəyat oldu ləbindən Xızrü Isa layəmut,
Gör bu qüdrət mö'cüzü kim, lə'li sirabındadır.

Surəti, yarəb, nə müshəfdir bu hüsnün surəsi
Kim, məlahətdən nə kim, dersəm anın babındadır.

Gərçi rəncur oldu şirin ləblərin eşqində can,
Həm şəfası şol dodağın qəndü innabındadır.

Gözləri meyxanədir anun, üzü Beytülhəram,
Gör bu beytullahı kim, meyxanə mehrabındadır.

Abi-heyvanın mizacı kövsərin xasiyyəti,
Səlsəbilin zövqü yarın lə'li-cüllabındadır.

Ey soran mə'şuqunun əsrarını naməhrəmə,
Gər bu razın məhrəmisən, üştə əhbabındadır.

Bəhri-eşqin sirrini arif bilir, sor arifə
Kim, bu sirri ol bilir kim, canı qərqabındadır.

Türrəsində zülfünün aşüftə könlüm çəkdigin,
Şol pərişanhala sor kim, könlü qüllabındadır.

Gülşəkər bazarə gəlməz, bal utanır, qənd ərir,
Şol həlavətdən ki, yarın şəkkəri-nabındadır.

Çün Nəsiminin Əbülfəzl oldu həqdən künyəsi,
Cümlə əsmanın hürufu eyni-əlqabındadır.

Canın vücudu sənsiz laşey kimi ədəmdir,
Səndən cuda dirilmək, müştaqına ələmdir!

Ruhülqüdüs dəmindən Isəbni-Məryəm oldu,
Ey bixəbər bu dəmdən, gəlgil ki, dəm bu dəmdir!

Saçın qaranqusundan üzün nuru göründü,
Hər qanda şam olursa, ardınca sübh dəmdir.

Var, ey qılan əzimət Beytülhərama, bil kim,
Mə’şuqənin camalı həm Kə’bə, həm hərəmdir.

Eşqin məni bəlasız bir dəm qomaz əlindən,
Aşiq olana daim eşqin işi kərəmdir.

Yarın qəmini könlüm kövnü məkana verməz,
Neçün ki, ol bilür kim, yarın qəmi nə qəmdir!

Zərqü riyadan oldu yoxsul əgər Nəsimi,
Yarın məhəbbətindən gör kim, nə möhtəşəmdir!

Səqahüm rəbbihüm xəmri dodağın kövsərindəndir,
Bu meydən içənin noğlu hədisin şəkkərindəndir.

Səba mişkin dəmindən kim, müəttər qılmış afaqı,
Müənbər zülfi-pürçinin əbirü ənbərindəndir.

Əgərçi əhli-tövhidə saçın həblülmətin oldu,
Səvadülvəchi-fiddareyn anın sevdalərindəndir.

Dəmi-Isa kimi nitqin dirildir cansız əşyanı,
Bu mö’cüz canfəza lə’lin müfərrəh gövhərindəndir.

Qiyamət qopdu hüsnündən, çalındı sur, həşr oldu,
Bu qovğalar ki, yayılmış, anın şuri-şərindəndir.

Behiştin əsvədül-eyni ki, hurül-eyndürür adı,
Yazılmış xəlqə bir ayət camalın dəftərindəndir.

Fəqih, ey əhsəni-surət, səni məscud əgər bilməz,
Bu asi divi-məl’unun xətası rəhbərindəndir.

Üzündür qulhüvərrəhman, saçındır əlləməl-Qur’an,
Əcəb, şol canların canı nə kamın gövhərindəndir?

Nigaran nərgisi-məsti nə fəttan eyn imiş gör kim,
Necə ruhül-əmin əsrük xumarın əbhərindəndir.

Gəl, ey can, eydə qurban ol ki, qurban olmayan eydə,
Nə oldu fitrə eydindən, nə anın əkbərindəndir.

Cahanın möhnəti çoxdur, anın dərdi-sərindən keç
Kim, irağ olduğu həqdən anın dərdi-sərindəndir.

Nəsimi masivəllahdan kəsildi, dilbəri buldu,
Nəsimi neyləsin, çünkim inayət dilbərindəndir.

Lə’lin şərabı şərbəti-kövsər degilmidir?
Üzün çırağı mehri-münəvvər degilmidir?

Nuri-əla ki, həq dedi nuri-ələl-yəqin,
Rüxsarın üzrə zülfi-müənbər degilmidir?

Ey daşavü türaba deyən qiyməti-göhər,
Insan bu hüsni-lütf ilə gövhər degilmidir?

Ey həsrətin zərilə göhər, istə mə’rifət,
Insanda mə’rifət göhərü zər degilmidir?

Surətdə ey deyən ki, münəzzəhdürür, ilah,
Gəl həqqə baxü gör ki, müsəvvər degilmidir?

Ta görmüşəm camalını, mənzurum oldu həq,
Həqqi görən nəzər ulu mənzər degilmidir?

Mən nazirəm nigarəvü arif qatında bu,
Billah ki, xub nazirü münzər degilmidir?

Şirin ləbin ki, həq ana ruhülqüdüs dedi,
Cənnətdəki şərab ilə kövsər degilmidir?

Aydır mana ki, nəqdini ver nisyəyə fəqih,
Heyvandan ol ülaikə kəmtər degilmidir?

Dövri-qəmərdə mərkəzi aşubü fitnənin,
Mişkin saçınla xali-müdəvvər degilmidir?

Lə’lin kimi Məsih dəmi mö’tədil mizac,
Hərgiz vücuda gəlmədi, cövhər degilmidir?

Surətdə gərçi adı bəşərdir Nəsiminin,
Mə’nidə gör ki, zati-mütəhhər degilmidir?

Yarəb, ol üzün çırağı şəm'i-xavərdənmidir?
Yarəb, ol sərvin yanağı vərdi-əhmərdənmidir?

Yarəb, ol mişkin səlasil kim, niqab olmuş gülə,
Mişki-tatari deyim, ya sünbüli-tərdənmidir?

Şol dodağın cür'əsindən əsrimiş ruhülqüdüs,
Yarəb, ol camın şərabı abi-kövsərdənmidir?

Ey şəkərdəndir deyən şol cani-şirinin ləbi,
Billah ani baxşıdan sor, gör ki, şəkkərdənmidir?

Lə'lini kim yad edərsə nuş olur ağu ana,
Şol ləbin zikri, əcəb tiryaki-əkbərdənmidir?

Ey səba, Isanəfəsdir canfəza buyun məgər,
Uğradı ərvaha, ya şol zülfi-ənbərdənmidir?

Bərgi-nəsrin üzrə, yarəb, şol düzülmüş incilər
Sübhdəm vaxtında düşmüş çeymi, ya tərdənmidir?

Zahid aydır, sevmə xubu, baxma anın üzünə,
Şol həcər yürəklü ahən, yoxsa mərmərdənmidir?

Dilbərin cövrü tükənməz, aşiqin bəxti uyur,
Bəxt edər, yarəb, bu cövrü yoxsa dilbərdənmidir?

Şol səadətli kəmər kim, qucar anın belini,
Taleyi məs'ud imiş, ya qüvvəti-zərdənmidir?

Adı məhv oldu Nəsiminin, qələm çək hərfinə,
Ey bu dəftərdən xəbərsiz, ol bu dəftərdənmidir?

Lə’li-nabın çeşməsində abi-heyvan gizlidir,
Dürci-yaqutunda, ey can, dürrü mərcan gizlidir.

Ləblərin şirin dəhanın gərçi əvvəl rəmz ilə
Açar əsrarın vəlakin, sirri-pünhan gizlidir.

Canımın canı qəmindir, şol səbəbdən, ey nigar,
Şad olur canım ki, canda daim ol can gizlidir.

Şol xədəngi-qəmzəni kim, canıma urdu gözün,
Qan gedər yürəkdən, amma zəxmi-peykan gizlidir.

Ənbərin zülfündə üzün gizlənirsə, nə əcəb,
Şəb niqabında həmişə mahi-taban gizlidir.

Ey təbibi-ami, əl çək çarə qılmaqdan mana,
Aşiqin canında daim dərdi-canan gizlidir.

Qane oldu dərdilə səndən Nəsimi, ey nigar,
Şol səbəbdən kim, sənin dərdində dərman gizlidir.

Dilbəra, zülfün şəbində mahi-taban gizlidir!
Ənbərin zülfündə daim ənbərəfşan gizlidir.

Yazılıdır səfhəsində surətin inna fətəh,
Hərf-hərf anın üzündə xətmi-Qur'an gizlidir.

Ləblərindən daima axar həyati-cavidan,
Şol səbəbdən dilbərin abında heyvan gizlidir.

Doğradı qəmzən xədəngi, bağrımı qan eylədi,
Şol səhamın qəmzəsində zəxmi-peykan gizlidir.

Gözü kordur, görmədi üzündə iman nurunu,
Gül yanağın çöhrəsində nuri-iman gizlidir.

Dərdimin çünkim dəvasın bilmədi, sordum təbib,
Şol səbəbdən kim, sənin dərdində dərman gizlidir.

Əhdü peyman istədi səndən Nəsimi, ey nigar,
Əhdü peymanında anın əhdü peyman gizlidir.

Sübhdəm dildarımı gördüm, otağından gəlir,
Eylə sandım huridir, firdövs bağından gəlir.

Ya məgər nuri-təcəllidir əyan oldu yəqin,
Ay ilə gün təl’əti gülgün yanağından gəlir.

Çeşmeyi-heyvan xəcildir ləblərindən daima,
Abi-kövsər şərbəti şirin dodağından gəlir.

Zülfünün çinilə çün kim, dəm urar mişki-tatar,
Rusiyəh bilməz, xəta hərdəm dəmağından gəlir.

Şaha, qəddü qamətin hər sərv görsə dər-çəmən,
Əgilər, səcdə edər, titrər, budağından gəlir.

Dilbəra, sən hüsnünə mən’ eyləmə mən aşiqi,
Qanda kim, bir gül bitər, bülbül qırağından gəlir.

Ey Nəsimi, ruhpərvər gəldi yarından nəsim,
Isanın ənfasıdır, yarın buxağından gəlir.

Türreyi-ənbərfəşan ömrüm şəbi-yeldasıdır,
Hülqümüzdə həlqətək ol kafirin sevdasıdır.

Lə'lü yaqutu anın quti-rəvanımdır mənim,
Zikrü fikrim şol həbibin lə'li-ruhəfzasıdır.

Dildə bu şirin kəlamın lə'li-şəkkərbarıdır,
Gözdə hər bina ki, var şol arizin şəhlasıdır.

Duşda gördüm sidrəqəd, dedim bəhəddi-müntəha,
Bilməzəm, ömrümmüdür, ya qamətin balasıdır.

Qoy məni qurban olum şol çeşmi-kafirküşə kim,
Mən təki hər güşədə yüz aşiqi-şeydasıdır.

Çeşmi-məstin, xalü zülfün fitnə saldı aləmə,
Ol gözəllər şahının ba-hər tərəf qovğasıdır.

Ey Nəsimi, səcdə qıl şol hüsnü bihəmtaya kim,
Aləmin çeşmi-çirağı, surəti-zibasıdır.

Gülgun rüxün gülü, səməni şərmisar edər,
Üzün xəyalı gözlərimi laləzar edər.

Mah üzrə zülfünü gecə dağıtma kim, məni
Aşüftə ruzigarü pərişanü zar edər.

Əğyar əlindən ah edərəm hər nəfəs, vəli
Cövrü həmişə aşiqi-miskinə yar edər.

Zülfün nə damü qəmzə, nə oxdur ki, gözlərin
Aşiqləri həmişə anınla şikar edər.

Zülfündə kim ki, görmədi hüsnün qiyamətin,
Bilməz saçın hesabını, ayruq şümar edər.

Mə'nidə gərçi can ləbi-lə'lin meyin içər,
Hüsnün şərabıdır ki, məni biqərar edər.

Gəlgil ki, şəm'ə nari-fəraqın hərarəti
Kar eyləməz bu rəsmə ki, canımda kar edər.

Ey Çin nigarü nəqşinə heyranü məst olan,
Gəl şol nigarı gör ki, nə nəqşü nigar edər.

Ey aşiqin həyatıvü ömrü saçı anın,
Cansızdır ol ki, adını mişki-tatar edər.

Ey dünyanın meyindən ulaşan xumarına,
Eşqin şərabın istə ki, dəf'i-xumar edər.

Vəsfində hər qaçan ki, Nəsimi açar ağız,
Cövhər ləbindən axarü gövhər nisar edər.

Dövri-qəmər məlahətin hüsnünə ixtimam edər,
Üzünə vahibüs-süvər xubluğu müstədam edər.

Lə'li-ləbin vüsalını can ilə istədi könül,
Fikri-məhalə gör necə düşdü, xəyali-xam edər.

Aşiqi-sadiqin qanı çün ləbinə halal imiş,
Aşiqə vəslini nədən lə'li-ləbin haram edər.

Kimsə cahanda görmədi sübh ilə şamı müctəme',
Gör necə zülfü arizin vəsləti-sübhü şam edər.

Mehr ilə Mahü Müştəri hüsnünə bəndədir, vəli
Sərv ilə sidrə özünü qamətinə qulam edər.

Fitnə gözün xumarını zahir əgər qılar isən,
Ağzına kim alır meyi, kim dəxi fikri-cam edər.

Şərhi-dəhani-yarımı kim ki, sorar Nəsimiyə,
Bir söz ilə hekayətin müxtəsərü tamam edər.

Sünbülün əbrində üzün mahını pünhan edər,
Kafəri islama çəkmiş, qarəti-iman edər.

Ey gözüm nuru, gözümdən getmə, iraq olma kim,
Canımı yaqdı fəraqın, gözümü giryan edər.

Ənbərəfşan zülfünü dağıtma nəsrin üzrə kim,
Aşiqin könlün pərişan, halı sərgərdan edər.

Gərçi lə'lin can verir aşiqlərə Isa kimi,
Gözlərin sevda meyindən əsrimişdir, qan edər.

Gərçi günəşdəndürür tabəndə mahın təl'əti,
Ey qəmər, xurşidü mahı təl'ətin taban edər.

Gəl məni qurtar fərağından ki, kafər canına
Damu etməz şol əzabı kim, mana hicran edər.

Can ilə iki cahanın ver, nigarın vəslin al,
Kim bu bey'i qılmadı, sərmayəsi xüsran edər.

Lə'lü mərcanın gözündən axıdar dürdanələr,
Gör bu ən'amı mana kim, lə'l ilə mərcan edər.

Gül yanağın həsrətindən ağlasam, eyb etmə kim,
Bülbülü şövqündə giryan şol güli-xəndan edər.

Sorma eşqin dərdini dərman təbibi-amə kim,
Yarə sor anı ki, aşiq dərdinə dərman edər.

Zülfü xalından Nəsimi əbcədi qıldı tamam,
Şimdi üzündən bəyani-surəti-rəhman edər.

Tabəndə üzün tabişi bədri-dücaya tə’n edər,
Fərxəndə zülfün sayəsi zilli-hümaya tə’n edər.

Xurşidi-tabana üzün gər tə’n edərsə, nə əcəb!
Aləmdə rövşəndir bu kim, sultan gədaya tə’n edər.

Badi-səba Isa kimi gərçi dirildir ölüyü,
Ənbərfəşan zülfün dəmi badi-səbaya tə’n edər.

Ey hüsnünə heyran qəmər, yarəb, nə cansan kim, üzün
Bədr olmuş aya dəq tutar, şəmsüz-zühaya tə’n edər.

Eşqinlə, ey arami-can, gərçi bu canım sayrudur,
Bir rənc imiş eşqin kim, ol yüz min şəfaya tə’n edər.

Mə’şuqunun cövr etdiyi yeydür vəfadan aşiqə,
Bilməz vəfanın qiymətin, hər kim cəfaya tə’n edər.

Bənzətməz anın üzünü aya Nəsimi, sor nədən,
Şol mə’nidən, hər kim üzün görmüşdür, aya tə’n edər.

Qamətinə əlif deyən gör nə uzun xəyal edər,
Hər ki, dilər vüsalını, arizuyi-məhal edər.

Şol ala gözdən, ey könül, sana derəm ki, uş saqın,
Uyxuda sanma ani, kim, uyxusu yoxdur, al edər.

Zülfünü xaki-rəh kimi saldı ayağı altına,
Gör necə xəlqi-aləmin ömrünü payimal edər.

Üzünü göstər, ey sənəm, xəlqi-cahana pərdəsiz,
Ta görələr ki, hər necə sün'ini bərkəmal edər.

Mülk ilə malü səltənət bir çöpə saymaz, ey könül,
Kim ki, dilər vüsalını, ya tələbi-camal edər.

Üzünə, qaşına anın özümü bənzədəm deyib,
Gah dönər ay bədr olur, gah özünü hilal edər.

Şərhi-qəmi Nəsiminin şol gözü qaşü saça sor,
Gör necə hər biri sana şərhü bəyani-hal edər.

Vüsalını diləyən canı həm cahanı nedər?
Şol abi-kövsəri içən nedər, bu canı nedər?

Məhəbbət əhlinə eşqin yetər, nedər zöhdü,
Şol asiyyə bu ziyanı bilən, ziyanı nedər?

Camalını görən, ey rövzənin gülüstanı,
Irəm sarayını, ya səhni-gülsütanı nedər?

Bəqayi-eşqin ilə canı cavidan olanın,
Bu cismi-faniyə ayruq nə hacət, anı nedər?

Qaşın hilalına baxıb görən üzün ayını,
Zavallı günəşi, ya mahi-asimanı nedər?

Səni bəşərdə bilən kim, nə gizli gövhərsən,
Bu kainata nə qılsın, ya bəhrü kanı nedər?

Boyun çinarını arzulayan ulu himmət
Çəməndə hərzə bitən sərvi-busitanı nedər?

Həqiqət əhlinə eynəl-yəqin yəqin oldu,
Yəqinə uğrayan ayruq xəta gümanı nedər?

Məkansız oldu Nəsimi, məkanı yoxdur anın,
Məkana sığmayan ol biməkan, məkanı nedər?

Qaçan ki, sünbüli-zülfün niqabı aya düşər,
Qəmər səhaba girər, afitaba sayə düşər.

Düşürmüş aya saçın zillinivü kölgəsinə,
Düşürmək ancılayın sayə şol hümaya düşər.

Qaşında gör ki, nə eynəl-yəqin imiş gizli,
Ki, bigüman qalır ol kim, gözü bu yaya düşər.

Səba saçından utandı ki, nafeyi-Çindir,
Məgər ki, silsiləsindən səba Xətaya düşər.

Xətadır əhsəni-təqvimi sevmək, aydır div,
Bu höqqə asiyi gör kim, necə xətaya düşər.

Əgərçi zülfünə dami-bəla demiş aqil,
Bu dama kim ki, gəlib düşmədi, bəlaya düşər.

Cahan müəttər olur hər səhər ki, badi-səba
Gəlir bu həlqeyi-zülfi-əbirsaya düşər.

Gəda qatında vüsalın səadəti düşməz,
Və gər düşərsə, mənim tək qəni gədaya düşər.

Əcəb şərabmış, ey saqiyi-əzəl, eşqin
Ki, cuş edər içən anı nə huyü haya düşər.

Nəsimi yara ulaşdı, nə düşdü münkirə kim,
Tutuşdu yürəyi yandı, yavuz qəzaya düşər.

Üzün bərgi-güli-tərdir, güli-tər,
Boyun sərvi-sənubərdir, sənubər.

Xuraman qamətin bər çeşmeyi-çeşm,
Səmənbərdir, səmənbərdir, səmənbər.

Sənin şəm'i-camalından vücudum
Münəvvərdir, münəvvərdir, münəvvər.

Bəninlə zülfü rüxsarın həmişə
Müənbərdir, müənbərdir, müənbər.

Mana peyvəstə şol mehrabi-əbru
Bərabərdir, bərabərdir, bərabər.

Zəhi dövlət ki, vəslin gah-gahı
Müyəssərdir, müyəssərdir, müyəssər.

Dimağım buyi-zülfündən dəmadəm
Müəttərdir, müəttərdir, müəttər.

Sənin nəqşi-xəyalın can içində
Müsəvvərdir, müsəvvərdir, müsəvvər.

Sənayedən nə sən'ətdir, Nəsimi
Mükərrərdir, mükərrərdir, mükərrər.

Yarımı ayırdın məndən, çərxi-qəddar, üştə gör!
Yürəkim baş oldu qəmdən, gəl içim yar, üştə gör!

Yaxdı, yandırdı məni yarın fəraqı, neyləyim,
Taqətim, səbrim tükəndi, yanıram zar, üştə gör!

Canımı anəstünarən şövqünə yandırma kim,
Olmuşam Musa kimi müştaqi-didar, üştə gör!

Dərdimin dərmanı sənsən, çarə kimdən istəyim,
Çarəsi səndəndir anın, çarü naçar, üştə gör!

Aşiqin imanı üzündür, saçın həblül-mətin,
Mən bu dini tutmuşam belimdə zünnar, üştə gör!

Arizin vərdi-cinandır, bülbülü-ruhülqüdüs,
Ey bu vərdin aşiqi, açıldı gülzar, üştə gör!

Doğradı qəmdən fəraqın bağrımı, şol yaradan,
Ürəgim qanı gözümdən axar, ey yar, üştə gör!

Ey güli-xəndanım, axır pərdədən çıx, qönçətək
Kim, məni şövqündə məcruh eylədi xar, üştə gör.

Ta üzün gülzarı təqdir eylədi məndən cüda,
Yandırır şövqün məni, ey üzü gülnar, üştə gör!

Gər ənəlhəq söyləməkdən dara asılsam nə qəm,
Bunca Mənsurun asılmış başı bər-dar, üştə gör!

Ta Nəsiminin vücudun nuruna yandırdı yar,
Nara düşmüşdür həsəddən necə əğyar, üştə gör!

Nuşin ləbinin lə'li, lə'li-ləbinin nuşin,
Şirin görürəm candan, candan görürəm şirin.

Cana, üzünüz ayı, ayı üzünüz, cana,
Rəngin çü güli-əhmər, əhmər çü güli-rəngin.

Hər kimsə səni görməz, görməz səni hər kimsə,
Kəndin çəkədir hicran, hicran çəkədir kəndin.

Hər kim sözün eşitdi, eşitdi sözün hər kim,
Təhsin qıladır əz can, əz can qıladır təhsin.

Cana, Nəsimini gör, gör Nəsimini cana,
Üstün qamıdan sözü, sözü qamıdan üstün.

Gözlərin rəmzi müəyyən göstərir vən-naziat,
Qaşların məqhur edibdir ləşkəri-vəl-adiyat.

Təl'ətin qibləsinə ta qıldılar candan sücud,
Müslümatü mö'minatü təyyibatü abidat.

Əhli-ülvi, qövmi-süfli, əqli-külli dedilər,
Üzünə şəmsüz zühavü saçına vəl-mürsəlat.

Müştəri, Bəhramü Keyvan, Tirü Zöhrə, Mehrü Mah
Hüsnünə təhsin oxurlar rüb'i-məskun, şeş cəhat.

Gər təfəhhüs qılsa kimsə şərqü qərbü tulü ərz,
Bulmayanlar sənə bənzər məfxəri-mövcud zat.

Ərz qılsam qamətindən, həşr olur yövmül-qiyam,
Söyləsəm kövsər ləbindən, məhv olur abi-həyat.

Səni könüldən Nəsimi sevdi, ey arami-can,
Cani-canansan, həqiqət, hüsnünə canlar zəkat.

Ey könlüm alan qaşları yay, gözləri cadu,
Ey nərgisi-məstü üzü gül, bənləri hindu.

Ta şövqi-cəmalın gələli eynimə qarşu,
Hər ləhzə qılır həsrət ilə bənzimi sayru.

Gəl firqəti-hicrin nə qılır canıma gör kim,
Nola qılasan lütf ilə bir dərdimə daru?

Nöh çərxi-fələkni qılıram ah ilə əzrəq,
Ol dəm ki, edəm vəslin üçün dərd ilə yahu.

Ol zülfi-müsəlsəlni mənim boynuma salgil,
Ta bəndi-səlasil düşə əz gərdəni-ahu.

Tərk etdi Nəsimi yoluna canü cahanı,
Ey qaşları yay, kirpigi ox, gözləri cadu.

Xəyali-lə'lidir yarın gözündən axıdan lö'lu,
Həvayi-zülfi-şəbrəngin salıbdır könlümə qayğu.

Bəlayi-nərgisi-məstin, cəvayi-tirkəşi-hicrin
Dəlibdir bağrımı, cana, üzübdür şol kaman əbru.

Mənim bu əqlü bu fikrim cəmisi tarimar oldu
Ki, hüsnün ləşkəri səf-səf yeridi könlümə qarşu.

Itabın çəkdiyim oldur səbəb kim, dünyada yoxdur
Sana bənzər ləbi xəndan, pərişanzülf, xürrəmru.

Nə ənbər danələr saçmış, nə mişkin damlar qurmuş,
Könül mürğini seyd etmiş dü zülfü xal ilə əbru.

Mələk üzlü, keyik gözlü, nəmək duzlu, şirin sözlü,
Təni nəsrin, bəni mişkin pərivəş, ənbərin geysu.

Nəsimi bağrını hicrin qarartdı şöylə kim, hərgiz
Ağarmaz yüz gəzin yusam əz in bəs ruyu çün hindu.

Görklü üzün nurundan aləm münəvvər oldu,
Şirin sözün qatında şəkkər mükərrər oldu.

Dodaqların sifatın hər kim gətirdi dilə,
Şol saət ol şirin söz ağzında şəkkər oldu.

Mişkin saçın qubarı yoldaş olalı yelə,
Cənnət kimi cahanın torpağı ənbər oldu.

Zülfün qarənğusına yol istər idi könlüm,
Üzün çırağı ana lütf ilə rəhbər oldu.

Şol uyxulu gözündən qopdu məgər qiyamət,
K'afaq* fitnəsindən pürşurü pürşər oldu.

Yalançı müddəinin at qəlbini ocağa,
Aşiqdir ol kişi kim, kamilməhək zər oldu.

Torpaq olanı sanma kim, düşə qiymətindən,
Torpaq olan Nəsimi gör kim, nə cövhər oldu.

---

* Ki afaq

Məgər mişkin saçın buyu nəsimi-sübhə yar oldu
Ki, canpərvər dəmi anın saçıntək mişkbar oldu.

Üzün dövründə, ey huri, camalü hüsn ilə hər kim
Qəmərtək də’viyə düşdü, üzündən şərmsar oldu.

Hilalın qabə qövseyni nə qüdrət qövsimiş, yarəb,
Ki, qurban oldu ol yaya cahanü can şikar oldu.

Üzündən kim ki, şeytantək hidayət bulmadı nura,
Əzəldən ta əbəd şəksiz, ləinü əhli-nar oldu.

Əgərçi firqətin qışdır ki, əl bərdü ədüvvid-din,
Həqə minnət ki, vəslindən gül açıldı, bahar oldu.

Nə tubadır boyun, yarəb ki, sərv ana sücud eylər,
Nə kövsərdir əcəb lə’lin ki, xəmri bixumar oldu.

Sulu inculərin dürcü qodu əndişə həm adın,
Məgər əndişənin eyni ləbin dövründə var oldu.

Səyamın ayıdır üzün, saçın qədr, üştə həq tanuq,
Gəl, ey vəhyi bilən arif ki, Qur’an aşikar oldu.

Saçın qalubəla rəmzin nədən faş eylədi xəlqə,
Məgər qövlü qərarından qərarı biqərar oldu?

Rümuzi-leylətül-əsra, gəl, ey zahid, eşit məndən
Ki, ol bildi bu sirri kim, əmini kirdigar oldu.

Hesabın saəti gəldi nə sayırsan, nə sanırsan?
Şümarın sağişin bil kim, hesabın bişümar oldu.

Vücudun şəhrini fəth et, əmirü şəhriyar ol kim,
Bu şəhri kim ki, fəth etdi, əmirü şəhriyar oldu.

Mən ol Mənsuram, ey arif ki, həqdən bulmuşam nüsrət,
Ənəlhəq söylərəm daim ki, ömrüm payidar oldu.

Hüvəl əvvəl, hüvəl axir gedər səndən ikilik kim,
Nəsimi yar ilə çün kim ulaşdı, külli-yar oldu.

Ta gördü günəş ay üzünü, dərbədər oldu,
Bədr aya zaval irdivü dövri-qəmər oldu.

Şümşad qədin qıldı irəm bağını cövlan,
Sərv ana əsir oldu da məndən betər oldu.

Ol jalə ki, düşdü güli-rüxsarınız üstə,
Bir qətrə yağış damdımı, min lalə tər oldu.

Arif içilən cür’əyi, ey xosrovi-xuban,
Alim dilinə düşdüvü sahibnəzər oldu.

Çün gördü Nəsimi üzünü zülfə dolaşmış,
Bildi, şəbi-hicr ötdüvü vəqti-səhər oldu.

Xoşa ol kimsə kim, vardır həbibi sən kimi məhru,
Şəkərgöftarü gülrüxsarü mişkinxalü ənbərbu.

Cahanə gəlməyə hərgiz özüntək bir daxi dilbər,
Səidəxtər, sənəmmənzər, pəripeykər, firiştəxu.

Zəhi sane' ki, sün'ündən yaratmış kəndu lütfündən,
Beli incə, ləbi qönçə, xəti rə'na, rüxü niku.

Gəl, ey sərrafi-qiymətgir, nəzər qıl mə'dəni-cövhər,
Zümürrüdxəttü siminbər, ləbi lə'lü dişi incu.

Qaşınla kirpigin, zülfün, üzündə bənlərin daxi,
Biri əyyar, biri tərrar, biri məkkar, biri cadu.

Səni sevənlərin halı bu dörd işdən degil xali:
Gəhi qovğa, gəhi sevda, gəhi divan, gəhi yarğu.

Əgərçi qulların çoxdur, Nəsimi hamıdan kəmtər,
Bəsa türkü bəsa zəngi, bəsa qıbçaq, bəsa hindu.

Gerçək xəbər imiş bu ki, xubun vəfası yox,
Kim sevdi xubu kim, dedi xubun cəfası yox?

Eşqin bəlası yox deyübən eşqə düşmə, var,
Kim aşiq oldu kim, dedi eşqin bəlası yox?

Anın ki, həcci-əkbəri, ey can, sən olmadın,
Beytül-hərama varmamış, anın səfası yox.

Şeytandır ol ki, surətinə qılmadı sücud,
Düşdü bir incə dərdə kim, anın dəvası yox.

Şol can ki, səndən özgə tələb etmədi murad,
Hicrində yaxmağın anı hərgiz rəvası yox.

Yarəb, nə şəm' imiş bu məhin üzü kim, anın
Üzü qatında şəmsi-zühanın ziyası yox.

Bimara can verər sənin, ey can, ləbin, vəli
Münkir sanır kim, ol şəfəteynin şəfası yox.

Gəlgil ki, qamu sovmü səlatın qəzası var,
Sənsiz keçən zamanü həyatın qəzası yox.

Eynin xətasız, ey büti-Çin, tökdü qanımı,
Türki-Xətadır, əslinə varar, xətası yox.

Fani cahana baxma, keçər ömrü sevmə kim,
Ömrün zavalı varü cahanın bəqası yox.

Yarın gəlir həmişə cəfası Nəsimiyə,
Sən sanma kim, Nəsimiyə yarın ətası yox.

Müshəfdir anın üzü, eyivallah,
Nun, eynü mim, qülhüvəllah.

Mə’şuq ilə aşiq oldu vahid,
Qafvəl-qələm oldu, qissə kutah.

Sufi nə bilir təriqi-vəhdət,
Meyxanəyə çünki bulmadı rah.

Min Yusifi çahına düşürmiş,
Şirin ləbi şol öyündüyü çah.

Qansı fələkin sitarəsisən
Kim, surətinə əsir olur mah?

Sənsən bu gün, ey əmiri-xuban,
Şirinlərə Xosrovu şəhənhaş.

Əhyayi-izam edər Nəsimi,
Zülfün qoxusuyla hər səhərgah.

Üzündə nurunu gördü əzəl günündə ilah,
Dedi ki: əşhədü-ən-la-ilahə-illəllah

Bu hüsnü lütf ilə kim gördü gögdə ya yerdə
Mələk surətlü bəşər, ya günəş sifətlü mah?

Gər günah isə qılmaq üzün qatında sücud,
Mən eylərəm bu günahı ki, fərz imiş bu günah.

Götür niqabıvü xəlqi qul eylə hüsnünə kim,
Məlahət əhlinə sənsən əmirü sənsən şah!

Hidayət eylədi qalu bəlada nura məni
Qara gözün, qara qaşın, bəninlə zülfi-siyah.

Qul oldu hüsnünə hurü mələk, nə surətsən,
Zəhi inayətü izzət, zəhi məratibü cah!

Nə hüsn imiş bu ki, vəsfində ruhi-natiqənin
Dili tutulduvü qıldı hədisini kutah.

Iki gözün əgər əgri degilsə, baxma iki
Ki, vəhdət əhlinə həqdən bilindi doğru rah.

Cahanda xalü xətindən rüxün çəri çəkmiş,
Zəhi şəhənşəhi-ə'zəm, zəhi uğurlu sipah!

Kərahət eyləmə aşiqdən, əbsəm ol, zahid,
Ki, yoxdur əhli-bəsirət qatında hiç ikrah.

Camalü-surətinə kim ki, olmadı qurban,
Iki cahanda nəsibi nədamət olduvü ah.

Cahan içində Nəsimi əliftək olduvü fərd,
Əgər inanmaz isən üştə şər', üştə güvah!

Gördüm üzünü, ey sənəm, əlminnətülillah,
Fərz oldu mana kim, deyəm əlminnətülillah.

Təqdiri-əzəl bəxtlə yar olduvü gəldi,
Tədbiri-müxalif ədəm, əlminnətülillah.

Məhbub ilə çün dövləti-vəsl oldu müyəssər,
Cəmşidi-zaman uş mənəm əlminnətülillah.

Birikdi zəfər fəth ilə, çalındı bəşarət,
Gəldi fərəh, uş getdi qəm əlminnətülillah.

Bəxtim günəşi doğduvü iqbal ilə gəldi
Şol şahi-səadətələm əlminnətülillah.

Zülmətdə bu gün çeşmeyi-heyvana irişdi
Şol Xızri-Skəndərhəşəm əlminnətülillah.

Zülfün xəbərin vardı, səba gör nə gətirdi,
Şol qasidi-fərruxqədəm əlminnətülillah.

Qıldı yenə aşiqlərinə lütfü inayət,
Şol adəti daim kərəm, əlminnətülillah.

Şol Kə’bə, cənabın qapısı dövlətü bəxtə,
Gör kim, necə oldu hərəm əlminnətülillah.

Ey şadiyə möhtac olan, ey rahətə müştaq,
Gəlgil ki, tükəndi ələm əlminnətülillah.

Ruhülqüdüsün nəfxəsidir nitqi-Nəsimi,
Həq der ki, yenə dəmbədəm əlminnətülillah.

Üzün gördüm, dedim əlhəmdülillah,
Boyun gördüm, oxudum qülhüvəllah.

Müsəlsəl zülfünü gördüm müənbər,
Müqəvvəs qaşların nəsrün-minəllah.

Qaraqçı gözləri yəğmalarından
Şəha, dönüb deməz əstəğfürillah.

Dodağın şərbəti eyni-şəfadır,
Səqahüm rəbbihüm min rəhmətüllah.

Camalın görmüşəm, ayrılmağım yox,
Əgər inanmasan, vallahü billah.

Mənim könlüm sana heyran olubdur,
Nə kim, cabbar qılır əlhökmilillah.

Otuz iki hüruf oldu vüsalın,
Vüsalındır, vüsalın, eyivallah!

Nəsuh gər qıldısa bir qatla tövbə,
Nəsimi tövbəsi tubu iləllah.

Gəl ey dilbər ki, hüsnün aya düşmüş,
Üzün görmüş günəş sevdaya düşmüş.

Çü zülfün qoxusu afaqı dutdu,
Məgər ənbər saçın səhraya düşmüş.

Mən ol zahid sözündən qorxmazam, çün
Ki, imruzu qoyub fərdaya düşmüş.

Gözündən fitnə yayılmış cahana,
Anınçün bu cahan qovğaya düşmüş.

Nə mövzun nöqtədir şirin dəhanın,
Xəbər ver kim, nədən əfvaya düşmüş?

Nə yəğmaçı moğolçindir bu, yarəb,
Gözün sevdaları yəğmaya düşmüş.

Nədən düşmüş saçın hindusifət kim,
Yanağın laleyi-həmraya düşmüş.

Nəsiminin gözü yarın qəmindən
Dolub, hər qətrəsi dəryaya düşmüş.

Ey camalın səhfəsində xətmi-Qur'an buldum uş,
Saçının hər tarəsində küfrü iman buldum uş.

Çün hidayət eyləmiş həq üzünə nuri-əzəl,
Şol səbəbdən kim, üzündə nuri-bürhan buldum uş.

Surətin müshəfdir, ey dilbər, üzün bədri-münir,
Təl'ətin şəmsüz-zühadır, mahi-taban buldum uş.

Ey səkiz cənnati-ədni ərz edən zahid mana,
Mən bu gün yarın camalında gülüstan buldum uş.

Cövrünə qıldım təhəmmül, səbr edib, yarın müdam,
Dərdə dərman andan oldu, dərdə dərman buldum uş.

Ey Nəsimi, vəchi-Allahın kəlamıdır üzün
Kim, bu vəchillah içində Fəzli-rəhman buldum uş.

Dövlətin dövranı gəldi, dərdə dərman buldum uş,
Şövqə yanmış cana həqdən abi-heyvan buldum uş.

Küfrüm ol mahın qara saçıdır, imanım üzü,
Ey bilən ümanü küfrü, küfrü iman buldum uş.

Eylədi könlümdə mə’va şol cəmalın gənci kim,
Kə’bənin gənci budur, şol gəncə viran buldum uş.

Ey məni də’vət qılan yarın günün cənnatına,
Mən bu gün şol xaki-dərgahı gülüstan buldum uş.

Ey behiştin hürisin arzulayan, gör şol məhi
Kim, mələk insan ilə hüsnündə heyran buldum uş.

Zülfünün şamında, yə’ni leylətül-qədrü bərat
Təl’əti-şəmsüzzühanın mahi-taban buldum uş.

Kirpigi, qaşı, saçı Qur’andır anın, üzü lövh,
Müshəfi itirmə, ey hafiz ki, Qur’an buldum uş.

Gər inanmazsan ki, adəm məzhəridir tanrının,
Həq-təalanın sözündən necə bürhan buldum uş.

Ey qaşın mehrabü, üzün qiblə iman əhlinə,
Mən anın qurbanı oldum, eydə qurban buldum uş.

Zülfüdür aşiqlərin halın pərişan eyləyən,
Şol səbəbdən dilbərin zülfün pərişan buldum uş.

Surətin əsrarına vəqf eylədim könlüm, vəli
Kə’bənin gəncidir ol kim, gəncə viran buldum uş.

Ey Nəsimi, dilbərin vəchi kəlamullah imiş,
Mən onun vəchində bismillahir-rəhman buldum uş.

Dəldi ol qəmzən səhamı, bağrıma kar etdi uş,
Bunca firqət kim, mənə ol çeşmi məkkar etdi uş.

Ta ki, şol məstanə eynin sağərindən içəli,
Başıma çıxdı xumarı, gör nə xummar etdi uş.

Söylərəm daim ənəlhəq, zülfünə can düşəli,
Ta məni Mənsurtək zülfündə bərdar etdi uş.

Düşdü çün anəstünarın şö'ləsi sərtaqədəm,
Musaya ol atəşi gör kim, nə ənvar etdi uş.

Tökdü çün yarın qəmindən bəhri-bəhreyn gözlərin,
Dişlərin əksi göründü, dürri-şəhvar etdi uş.

Hüsnünə baxdıqca daim, oxuram inna-fətəh,
Lövhi-məhfuzun hürufun həq çü izhar etdi uş.

Sirrini faş etmə yarın, ey Nəsimi, əbsəm ol,
Neçün ol əsrarı həq aləmdə əsrar etdi uş.

Hərami gözlərin yəğmaya düşmüş,
Zəhi-cadu, nə xoş sevdaya düşmüş?

Nədən düşmüş müənbər zülfünə tab,
Məgər şol vəch ilə kim, aya düşmüş?

Görün bu sünbülü hindusifət kim,
Necə xurşid ilə həmsayə düşmüş.

Əyağından saçın başın götürməz,
Cinanı gör nə ali paya düşmüş.

Çəmən sərvini anma, tubidən keç
Ki, könlüm şol qədi-balaya düşmüş.

Meyü şahid bu gün, şəksiz, haramdır
Ana kim, qüsseyi-fərdaya düşmüş.

Gözümdə inci dişlərin xəyalın
Görən aydır, göhər dəryaya düşmüş.

Nə fəttansan ki, cümlə səndən ötrü
Cahan ucdan-uca qovğaya düşmüş.

Ənəlhəq çağırır çəngü dəfü ney,
Yalançı laila-illaya düşmüş.

Qərar etməz könül zülfündən ayrı,
Bu sərgərdan uzun sevdaya düşmüş.

Yanaq üzrə saçın tavusa bənzər
Ki, seyri cənnətül-mə’vaya düşmüş.

Nə şirin nöqtədir kim, ol qələmdən,
Damub şol lə’li-ruhəfzaya düşmüş.

Nəsimi oldu qurban qaşın üçün,
Zəhi qurban, qaşıntək yaya düşmüş.

Cə’di-zülfün ənbərəşfan eyləmiş,
Nafeyi-Çini pərişan eyləmiş.

Canü dil hər dəm necə top olmasın,
Çün nigarım zülfü çövkan eyləmiş.

Zülfü dağıtmış rüx üzrə ol sənəm,
Kafiri-Çin qəsdi-iman eyləmiş.

Aşiqin qanına bandırmış əlin,
Gör bu çox dəstan nə dəstan eyləmiş?

Gözləri, qaşı ənəlhəq çağırır,
Gör bu sirri kimdə pünhan eyləmiş.

Hüsn içində görməmiş mislin fələk,
Bunca dövranı ki, dövran eyləmiş.

Eydi-əkbərdir Nəsimiyə bu gün,
Canını şol maha qurban eyləmiş.

Ləbinə əhli-nəzər can dedilər, gerçək imiş
Ağzına nöqteyi-pünhan dedilər, gerçək imiş.

Lə'lini xəttin ilə sormuşam ərvaha, anı
Xızrilə çeşməyi-heyvan dedilər, gerçək imiş.

Adəmin surətinə vəcdə qılanlar ki, səni
Gördülər, surəti-rəhman dedilər, gerçək imiş.

Dedilər qamətinə sidrə kamal əhli, vəli
Xalq anı sandı ki, yalan dedilər, gerçək imiş.

Surətin münkirinə elmlə iman əhli,
Ana kim, div ilə şeytan dedilər, gerçək imiş.

Cənnət əhli ki, üzün bağına, ey cənnətü hur,
Rövzeyi-xüld ilə rizvan dedilər, gerçək imiş.

Qələmin sirrini həqdən bilən ol tayifə kim,
Ənbərin zülfünə heyran dedilər, gerçək imiş.

Mö'cüzat əhli ki, yazın görücək surətinə
Lövhi-məhfuz ilə Qur'an dedilər, gerçək imiş.

Ey Nəsimi ki, nəzər əhli vücudun evinə
Laməkan gəncinə viran dedilər, gerçək imiş.

Ey cənnətin xəndan gülü, acı fərağın xar imiş,
Müştaqə dirlik sənsizin, vallah ki, çox düşvar imiş.

Sənsiz gərəkməz künfəkan, ey surəti-rəhman mana,
Eşq əhlinin məqsudu çün kövnü məkandan yar imiş.

Musa təcəlli nurunu görmək təmənna eylədi,
Məqsudu mə'lum olu kim, həqdən anın didar imiş.

Nəfsinlə yar ol, yarı bil, yad olma həqdən, arif ol,
Şol müddəi kim, həqqilə yar olmadı, əğyar imiş.

Gər tanımışsan nəfsini, gerçək bilirsən həqqini,
Həqdir səninlə, qəm yemə, neçün ki, həqqin yar imiş.

Mənsur ənəlhəq söylədi, həqdir sözü, həq söylədi,
Anın cəzası qəm degil, biganədən gər dar imiş.

Qalu bəlanın əhdini unutmazam, unutma kim,
Imanı tövhid əhlinin şol əhdü şol iqrar imiş.

Münkir inanmaz həqqə, gəl eyb etmə anı, fariğ ol,
Şol mə'nidən kim, münkirin daim işi inkar imiş.

Tövhidə gəlməz müşrikin qəlbivü eyni əhvəlin,
Sən ol müvəhhidlərdən ol, k'anlar ülül-əbsar imiş.

Gülgün yanağından mana kəşf oldu, ey bədri-düca,
K'əhli vəfanın cənnəti şol bağü şol gülzar imiş.

Hər zahidin kim, təsbihi şol zülfi-pürçin olmadı,
Zikri həbavü hərzədir, səccadəsi zünnar imiş.

Həq surətindən göz yumar zahid, nədəndir, bilməzəm,
Şol məkri çox şeytan kimi haqdan məgər bizar imiş.

Arif qatında dünyanın miqdarı yoxdur zərrəcə,
Mizana çək miqdarını, gör kim, nə bimiqdar imiş.

Nəzmi Nəsiminin yəqin Allahü nurun şərhidir,
Ol nuru hər kim bilmədi, həqdən nəsibi nar imiş.

Ey camalın nuri-sübhanəlləzi əsra imiş,
Əbdəhu leyla tapundur, məscidi-Əqsa imiş.

Sözlərinin hər birisi nəfxeyi-ruhül-qüdüs,
Ləblərin mə'na ilə yöhyül-iləl mövta imiş.

Yazdı alnında xuda inna fətəhna surəsin,
Qaf vəl-Qur'an üzündür, sidreyi-ə'la imiş.

Arizinlə iki zülfün layəzali görünür,
Mə'niyi-səb'ülməsani əlləməl-əsma imiş.

Eşigin aşiqlərə Beytülhəramın Mərvəsi,
Kə'bə üzün oldu, zülfün ürvətül-vüsqa imiş.

Təl'ətin nuri-təcəlli, vəzzühanın məzhəri,
Qabə qövseyn oldu qaşın, zülfün öv-ədna imiş.

Ey Nəsimi, çünki könlün vəhdətin dəryasıdır,
Yeddi dəniz qübbəsinə mövc uran dərya imiş.

Axır-zamanın fitnəsi şol gözləri şəhla imiş,
Gəl düş anın sevdasına, gör kim, nə xoş sevda imiş.

Eşqində məhv oldu cahan, hüsnündə heyran oldu can,
Ey küntə-kənzin gövhəri, eşqin əcəb dərya imiş.

Düşdü saçın zəncirinə aşüftə könlüm, neyləsin,
Zəncirə düşməkdir işi hər qanda bir şeyda imiş.

Ey tubiyi arzulayan himməti alçaqlar kibi,
Qəddini yarın arzula kim, tubundən ə'la imiş.

Eşqində, ey can nüsxəsi, qovğadadır aləm bu gün,
Aləmdə daim hüsn ilə eşqin işi qovğa imiş.

Təsbih ilə səccadəyi ərz etmə əhli-hala kim,
Həblülmətini aşiqin şol zülfi-ənbərsa imiş.

Şol alı çox ala gözün könlüm evin yəğmaladı,
Yəğmaçı türkün adəti hər qandasa yəğma imiş.

Dünyadavü üqbada çün həmta bulunmaz hüsnünə,
Şol vahidi gör kim necə bimislü bihəmta imiş.

Gəzdim vücudum şəhrini, dolu-dolu gördüm anı,
Hər yerdə çün sənsən, əcəb, adın nədən bica imiş?

Çıxdı Nəsiminin sözü me'raca, ey xülqü həsən,
Gəlgil ki, sübhanəlləzi əsraya xoş əsra imiş.

## LÜĞƏT

**A**

*Ab* – Su
*Aba* – Atalar
*Abid*i-əsnam – Bütpərəst
*Afitab* – Günəş
*Ahən* – Dəmir
*Al* – 1. Qırmızı, 2. Nəsil, 3. Hiylə
*Am* – Cəmiyyət
*Amac* – Hədəf
*Ariz* – Üz
*Assi* – Xeyir
*Aşina* – Tanış, dost
*Aşüftə* – Dağınıq, həyəcanlı
*Ayıtma*q – Demək, söyləmək
*Ayruq* – Ayrı

**B**

*Bab* – Qapı
*Bad* – Külək
*Bak* – Qorxu
*Bala* – Hündür, uca
*Başəd* – Olsun ki…
*Beytül-həram* – Hərəm evi – Kəbə mənasında
*Besya*r – Çox
*Beyza* – Ağ, bəyaz
*Bə'd* – Sonra
*Bədx*u – Pis xasiyyətli
*Bədri-müəmməm* – Əmmaməli ay
*Bəğayə*t – Çox
*Bəhr* – Dəniz
*Bəxil* – Paxıl, xəsis
*Bəid* – Uzaq
*Bəqa* – Baqilik

*Bən* – Xal
*Bərg* – Yarpaq
*Bərgüzidə* – Seçilmiş
*Bərq* – İdırım, parıltı
*Bəstə* – Bağlı
*Bəyyinat* – Sübutlar
*Bəzm* – Məclisə
*Bibədəl* – Əvəzsiz
*Bibər* – Barsız
*Bidad* – Zülm
*Bimar* – Xəstə
*Bina* – Gözlü
*Bistü-həşt* – Iyirmi səkkiz
*Bişüma*r – Saysız-hesabsız
B*ulmaq* – 1. Olmaq. 2. Tapmaq
*Bülənd* – Uca
*Bürhan* – Dəlil, sübut
*Bürqə* – Niqab, örtük
*Büryan* – Yanmış

**C**

*Ca* – Yer
*Camə* – Paltar
*Cami-müsəffa* – Saf şərab
*Canəvər* – Heyvan
*Cavid* – Əbədi
*Cə'd* – Qıvrım (saçda)
*Cəhl* – Cahillik
*Cəmil* – Gözəl
*Cərəs* – Zınqırov
*Cifeyi-murdar* – Murdar leş
C*izginmək* – Fırlanmaq, dolanmaq
*Cövşən* – Zireh
*Cud* – Səxavət
*Cuyəndə* – Axtaran

*Cüda* – Ayrı
*Cüllab* – Şərbət

**Ç**

*Çah* – Quyu
*Çakə*r – Nökər
*Çar ənasir* – Dörd ünsür (torpaq, hava, su, od)
*Çeşm* – Göz
*Çeşməyi-heyvan* – Dirilik bulağı
*Çələb* – Tanrı
*Çəndan* – O qədər
*Çər*i – Qoşun

**D**

*Dam* – Tələ
*Damən* – Ətək
D*amu* – Cəhənnəm
*Dan*a – Bilici
*Danla* – Sabah
*Dapu* – Xidmət, qulluq
*Dar* – Ev
*Daru* – Dərman
*Darül-qürur* – Qürur evi – Bu dünya mənasında
*Das* – Oraq
*Deyr* – Monastır, hücrə
*Dəgmə* – Nadan
*Dəğəl* – Fırıldaq
*Dəhan* – Ağız
*Dəndan* – Diş
*Dəni* – Alçaq
*Dərban* – Qapıçı
*Dəyyar* – Sakin
*Dışrə* – Çölə, xaricə
*Didar* – Görüş

*Didə* – Göz
*Di*l – Ürək
*Dilfirib* – Ürəkaldadan
*Diltəşnə* – Ürəyiyanan
*Dimağ* – Kəllə, beyin
*Diraz* – Uzun
*Diriğ* – Heyif, əfsus
*Dud* – Tüstü
*Duxan* – Tüstü
*Dun* – Alçaq
*Dur* – Uzaq
*Duş* – Yuxu
*Duzəx* – Cəhənnəm
*Dürc* – Mücrü
D*üşvar* – Çətin

**E**

*Eyd* – Bayram
*Eyn* – Göz
*Eynəl-yəqin* – Yəqin etmənin
2-ci (görmə) mərhələsi
*Eyü* – Yaxşı

**Ə**

*Əbd* – Qul
*Əbhər* – Şah damar
*Əbr* – Bulud
*Əbru* – Qaş
*Əbsəm* – Lal
*Ədu* – Düşmən
*Ədvar* – Dövrlər
*Əhvəl* – Çəpgöz, əyrigöz
*Əhya qılmaq* – Diriltmək
*Əhmə*r – Qırmızı
*Əxtər* – Ulduz
*Əksi* – Nöqsan
*Əqfas* – Qəfəslər

Əlfaz – Sözlər
*Ə'ma* – Korluq
*Əmvac* – Dalğalar
*Əmmarə* – Əmr edən
*Ənaniyyət* – Eqoizm, mənəmmənəmlik
*Ənar* – Nar
*Ənbərəfşan* – Ənbər saçan
*Ənbiya* – Peyğəmbərlər
*Əncü*m – Ulduzlar
*Əndək* – Az
*Əndə*r – Içində
*Əndişə* – Fikir
*Ənduh* – Qüssə
*Əngur* – Üzüm
*Əngüşt* – Barmaq
*Ənis* – Dost
*Ənkərəl-əsvat* – Qulaqbatıran, ətürpərdən (səs)
*Ənvar* – Nurlar
Ər – Əgər
*Ərə* – Mişar
*Ərğəvan* – Ərğəvan (al qırmızı rəngli gül)
*Ərvah* – Ruhlar
*Ərz* – Yer
*Əsbab* – Səbəblər
*Əsəl* – Bal
*Əsma* – Adlar
*Əsrar* – Sirlər
Ə*srük* – Sərxoş
*Əşcar* – Ağaclar
*Əşk* – Göz yaşı
Ə*şkal* – Çətin
*Əyağ* – Badə
*Əyya*r – Zirək, hiyləgər
*Əzimət* – Səfər

**F**

*Fanus* – Fənər
*Fariğ* – Boş, qayğısız
*Fəqir* – Yoxsul
*Fərda* – Sabah
*Fərxəndə* – Xoşbəxt
F*irdövs* – Cənnət
*Firiştə* – Mələk
*Fiz-zülmətil-məmat* – Ölüm qaranlığında

**G**

*Geysu* – Saç
*Gənc* – Xəzinə
*Gərm* – Isti
*Gəz* – Uzunluq ölçüsü; Dəfə
*Gireh* – Düyün
*Giryan* – Ağlar
*Git*i – Dünya
*Giyah* – Ot
*Gunə* – Bu cür
*Guş qılmaq* – Eşitmək
*Guşimal* – Qulaq burması
*Güftar* – Danışıq
*Gülzari-cinan* – Cənnət gülzarı
*Güm etmək* – Itirmək
*Gümrah* – Yolunu azmış
G*üvah* – Şahid
*Güzidə* – Seçilmiş

**Ğ**

*Ğəbğəb* – Buxaq
*Ğəni* – Varlı, zəngin
*Ğərib* – Yaxın

**H**

*Hadi* – Düz yolla aparan
*Haziq* – Bilici, təcrübəli
*Həbib* – Dost, sevgili
*Həcci-əkbər* – Böyük həcc
*Həcər* – Daş
*Həqbin* – Həqiqət görən
*Həmul* – Kəcavə
*Hərgiz* – Hələ
*Həsud* – Həsəd edən
*Həzaran* – Yüzlərlə
*Hidayə*t – Doğru yolda rəhbərlik
*Hirman* – Qadağan, rədd cavabı
H*übbülvətən* – Vətən sevgisi
*Hüdhüd* – Şanapipik

**X**

*Xab* – Yuxu
*Xak* – Torpaq
*Xar* – Tikan
*Xasir* – Uduzan, zərər çəkən
*Xatəm* – Möhür, möhürlü üzük; Son
*Xeyrül-bəşər* – Ən yaxşı insan
(Məhəmməd peyğəmbər)
*Xəmr* – Şərab
*Xər* – Uzunqulaq
*Xirqə* – Zahidlərin geydiyi qaba
paltar
*Xoşnud* – Razı, şən
*Xub* – Yaxşı
*Xun* – Qan
*Xurşid* – Günəş
*Xücəstə* – Yetkin, ağıllı
*Xüld* – Əbədiyyət, ölməzlik
*Xüsran* – Ziyan, ölüm

I

*İxlas* – Səmimilik
*İxtitam* – Tamamlanma, yekun
*İllət* – Səbəb, xəstəlik
*İmruz* – Bu gün
*İrişmək* – Çatmaq
*İstifham* – Sual, xahiş
*İstiva* – Ekvator xətti
*İşbah* – Oxşarlar
*İştiyaq* – Həvəs
*İttisal* – Birləşmə, qovuşma

**K**

*Kah* – Saman
*Kar* – İş
*Kəbənək* – Yapıncı
*Kəlamüllah* – Allah sözü
*Kəlb* – It
*Kəm* – Az
*Kəndu* – Özü
*Kənz* – Xəzinə
*Kəzza*b – Yalançı
*Kibr* – Lovğalıq, təkəbbür
*Kibriya* – Böyüklük, əzəmət
*Kilab* – Itlər
*Kilk* – Qələm
*Kisvə*t – Paltar
*Kişvə*r – Ölkə
*Kövkə*b – Ulduz
*Kuh* – Dağ
*Kuş*iş – Səy, çalışmaq
*Küla*h – Papaq
*Künfək*an – Kainat
K*ünyə* – Ləqəb
*Küstaq* – Sırtıq, cəsarətli

**Q**

*Qaim* – Möhkəm

*Qanğı* – Hansı
*Qasir* – Sayğısız, zəif
*Qate'* – Qəti, mübahisəedilməz
*Qeyd* – Məhdudiyyət, maneə
*Qəhr* – Qəzəb
*Qəlla*ş – Fırıldaqçı
*Qəmər* – Ay
Q*əncər*ü – Necə
*Qət' etmək* – Kəsmək
*Qəza* – Yemək
*Qissə* – Hekayət, nağıl
Q*iyas* – Müqayisə, bənzərlik
*Qiyməti-ərzan* – Baha qiymət
*Qo* – Qoy
*Qövl* – Qohum
*Qubar* – Toz
*Qutlu* – Xoşbəxt
*Qürs* – Disk, dairə

**L**

*La* – Yox
*Lacərəm* – İstər-istəməz;
Əlbəttə; Buna görə
*Laf* – Cəfəngiyyat
*Laməkan* – Məkansız
*Laşə* – Leş
*Laübali* – Qayğısız
*Layəmut* – Ölməz
*Layəzal* – Ölməz, əbədi
*Leyl* – Gecə
*Ləb* – Dodaq
*Ləbən* – Süd
*Ləhvü lə'b* – Pozğunluq
*Ləmyəzə*l – Əbədi, ölməz
*Ləşkər* – Qoşun
*Lisan* – Dil
*Lö'löi-şəhvar* – Şaha layiq inci

**M**

*Ma* – Su
*Mahi* – Balıq
*Manəndi-cəllad* – Cəllad kimi
*Mar* – İlan
*Mazi* – Keçmiş
*Meyfüruş* – Meysatan
*Məani* – Mə'nalar
*Məbdə*' – Başlanğıc
*Məcruh* – Yaralı
*Məgəs* – Milçək; Arı
*Məhcub* – Utancaq, təvazökar
*Məhcur* – Ayrılmış, tərk edilmiş
*Məxmur* – Sərxoş, xumar
*Məxzən* – Xəzinələr
*Məkkarə* – Məkrli qadın
*Məqdur* – Qüvvəçatan, qaçılmaz
*Məqhur* – Qəhr edilmiş
*Məlamət* – Danlaq
*Məlik* – Padşah
*Məmat* – Ölüm
*Mə'mur* – Düzəldilmiş,
təmir edilmiş
*Mən' etmək* – Çəkindirmək
*Mərdüm* – Xalq
*Mərəz* – Xəstəlik
*Mərg* – Ölüm
*Mərkəb* – Minik heyvanı
*Məsrur* – Şad
*Məstur* – Gizli
*Mətlə'* – Günəşin doğduğu yer;
Başlanğıc
*Mə'va* – Məskən, sığınacaq
*Midad* – Qələm
*Miftah* – Açar
*Mir* – Ağa
*Mir'at* – Güzgü
*Misbah* – Çıraq, şamdan

*Miyan* – Orta, ara
*Möhtəmil* – Ehtimal edilən
*Möhtəsib* – Möhtəsib (şəriət
işlərinə baxan məmur)
*Mövc* – Dalğa
*Mu* – Saç, tük
*Munis* – Yaxın dost
*Murçə* – Qarışqa
*Mübəssi*r – Uzaqgörən
*Müctəme* – Birləşmiş
*Müdbər* – Bədbəxt, uğursuz
*Müəlla* – Yüksək, uca
*Müəlləq* – Asılmış
*Müfərrih* – Şənləndirən
*Müğləq* – Aydın olmayan
*Müxalif* – Düşmən
*Müxtərə* – Yaradılmış, ixtira edilmiş
*Müin* – Köməkçi
*Müqəyyəd* – Bağlanmış, qayğıkeş
*Müqim* – Sakin
*Mülazimət* – Qulluq
*Müləvvəs* – Ləkələnmiş;
murdarlanmış
*Münadi* – Carçı
*Münafiq* – Yaltaq, qeyri-səmimi;
Nifaq salan
*Münəvvə*r – Nurlu
*Münəzzəh* – Günahsız, təmiz
*Münfəil* – Pərt olmuş, utanmış
*Münkir* – İnkar edən
*Münzəl* – Nazil olmuş, göndərilmiş
*Mürdə* – Ölü
*Mürğ* – Quş
*Mürsəl* – Peyğəmbər
*Mürşid* – Ruhani rəhbər
*Müsəxxər* – Fateh
*Müsəlləm* – Mübahisəedilməz
*Müsəvvər* – Təsvir edilmiş
*Müshəf* – Kitab

*Müstədam* – Uzun, əbədi
*Müstəğni* – Varlı, zəngin
*Müstəhlik* – Ödənilmiş;
Məhv edilmiş
*Müstəqbəl* – Gələcək
*Müşrik* – Bütpərəst
*Müştaq* – Həvəskar
*Mütabiət* – Tabelik
*Mütəhhir* – Təmizləyən
*Müttəle'* – Xəbərdar
*Müzəyyən* – Bəzənmiş

**N**

*Nabaliğ* – Yarımçıq, yetkinliyə
çatmamış
*Naci* – Qurtulmuş
*Naqisüqul* – Kəmağıl
*Nam* – Ad
*Nan* – Çörək
*Na*r – Od
*Nase*h – Nəsihət verən
*Naşüküftə* – Açılmamış
*Navək* – Ox ucu
*Netəkim* – Necə ki
*Nəbat* – Bitki
*Nəfxə* – Nəfəs, meh
*Nəfsi-şum* – Uğursuz nəfs
*Nə'im* – Xoşbəxt həyat
*Nəməd* – Keçə
*Nəmək* – Duz
*Nəng* – Həya
*Nəsnə* – Bir şey
*Niga*h – Baxış
*Niku* – Yaxşı
*Nim* – Yarı
*Nisf* – Yarı
*Niş* – Neştər (arıda)

*Nişa*t – Şadlıq
*Niyzə* – Nə üçün
*Nu*r – İşıq
*Nüktə* – Incə söz, fikir.

**Ö**

*Övraq* – Vərəqlər

**P**

*Payan* – Son
*Payəndə* – Möhkəm, daimi
*Peyğam* – Məktub
*Peykər* – Gözəl; Bədən; Ulduz
*Pənbə* – Pambıq
*Pənd* – Nəsihət
*Pərçəm* – Bayraq
*Pərhiz etmək* – Çəkinmək
*Pərtöv* – Işıq, parıltı
*Pərva* – Qorxu
*Pəşminə* – Yundan toxunmuş
*Püxtə* – Bişmiş
*Pürbəl*a – Bəlalı
*Pürxab* – Yuxulu
*Pürtab* – Qıvrım
*Püşt* – Arxa

**R**

*Raz* – Sirr
*Rəhiq* – Təmiz şərab
*Rəhnüm*a – Yolgöstərən
*Rənc* – Əziyyət
*Rəzzaq* – Ruzi verən (Allah)
*Rind* – Qayğısız, şən həyat sürən adam
*Riştə* – İp, sap
*Rizvan* – Cənnət

*Rövşən* – İşıqlı
*Rövzə* – Bağ
*Ru, ruy* – Üz
*Ruhulqüdü*s – Müqəddəs ruh,
Cəbrayıl
*Ruz* – Gün
*Rüx* – Üz
*Rümman* – Nar
*Rümuz* – Rəmzlər

**S**

*Sağər* – Badə
*Salik* – Düz yolla gedən
*Sani* – Ikinci
*Sayə* – Kölgə
*Sayru* – Xəstə
*Sevda* – 1. Öd. 2. Məhəbbət
*Seyd* – Ov
*Səbah* – Bulud
*Səbur* – Səbirli
*Səbükbar* – Yükü yüngül
*Səddəqna* – Sidq etdik; Inandıq
*Səhl* – Çətin
*Səxi* – Səxavətli
*Səid* – Xoşbəxt
*Səidəxtər* – Xoş taleli
*Səqim* – Xəstə, gücsüz
*Səqqa* – Sudaşıyan
*Səlasil* – Zəncirlər
*Səlat* – Birləşmə, əlaqə; Dua
*Səlib* – Xaç
*Səm*’ – Qulaq
*Səmək* – Balıq
*Səng* – Daş
*Sər* – Baş
*Sərab* – İlğım
*Sərgəştə* – Avara, başıpozuq
*Sərir* – Taxt, yataq

*Sərnigun* – Çevrilmiş, başıaşağı
*Sərzəniş* – Danlaq
*Səyyiat* – Günahlar
*Sib* – Alma
*Sibat* – Ordu
*Sidrə* – Lotos
*Sim* – Gümüş
*Sinək* – Milçək
*Sitarə* – Ulduz
*Sivü dü* – Otuz iki
*Siyam* – Orucluq
*Sövqənd* – And
*Sud* – Fayda
*Suf* – Yun, qaba yun parça
*Sunmaq* – Təqdim etmək
*Süfl* – Aşağı, bünövrə
*Sürəyya* – Ulduz bürcləri
*Sürx* – Qırmızı

Ş

*Şahid* – Gözəl, sevimli
*Şayəd* – Bəlkə, yəqin
*Şəb* – Gecə
Ş*əcər* – Ağac
*Şəhd* – Bal
*Şəhnə* – Darğa
*Şəqi* – Bədbəxt
*Şəqq etmək* – Şaqqalamaq, bölmək
*Şəmim* – Xoş ətirli
*Şəmmə* – Bir az, nəsə
*Şəmsüzzüha* – Səhər günəşi;
parlaq günəş
*Şəmşir* – Qılınc
*Şərabi-nab* – Saf şərab
*Şərməndə* – Utanmış
*Şəst* – Altmış
*Şə'şəə* – Parıltı, əzəmət
*Şətrənc* – Şahmat

*Şikəstədil* – Ürəyi sınıq
*Şi*r – 1. Süd. 2. Şir
*Şirk* – Çoxallahlılıq
*Şitab etmək* – Tələsmək
*Şol* – O
*Şuridə* – Qarma-qarışıq, həyəcanlı
*Şümar* – Say

**T**

*Tabəndə* – Parıldayan
*Tabiş* – Parıltı, istilik
*Taət* – Din və dünya qaydalarına
itaət etmə
*Tamat* – Boş sözlər, cəfəngiyyat
*Tanıq* – Şahid
*Tarik* – Qaranlıq
*Teyb* – Xoş ətirli
*Teyy* – Ərzində
*Təbdil etmək* – Dəyişmək
*Təcəlli* – Əzəmətli zühur etmə
*Təfəhhüs* – Soruşma, axtarma
*Təfərrüc* – Əyləncə
T*əhsin* – Yaxşılaşdırma, bəyənmə
*Təhtüs-səra* – O dünya, yer altı
*Təqrir* – Təsdiq etmək
*Tən* – Bədən
*Tənab* – Kəndir
*Tərə*b – Şadlıq
*Təriq* – Yol
*Təsərrüf* – Sərf etmə, dəyişdirmə
T*əşbih* – Bənzətmə
*Təvaf* – Kəbənin başına dolanmaq
*Təvil* – Uzun
*Təzvi*r – Hiylə
*Tib* – Bax: Teyb
*Tiğ* – Qılınc
*Tilkə* – Bu, budur
*Tima*r – Əlac

Tir – Ox
*Tö'mə* – Yemək
*Tövhid* – Birlik
*Tövq* – Halqa, boyunbağı
*Türfə* – Yeni, əcaib şey
*Tüyur* – Quşlar

**U**

*Uçmaq* – Cənnət
*Ufa* – Kiçik
*Uluğ* – Böyük

**Ü**

*Üftadə* – Yıxılmış, düşmüş
*Üqba* – O dünya
*Ümm-ül-kitab* – Kitabın anası (Quran); Quranın fatihə surəsi
*Ümmühat* – Analar
*Üşşaq* – Aşiqlər

**V**

*Vəbal* – Çətinlik
*Vərd* – Qızılgül
*Vərtə* – Təhlükə

**Y**

*Yarın* – Səhər
*Yey* – Yaxşı
*Yədi-beyza* – Ağ əl
*Yəğm*a – Qarət
*Yəzdan* – Allah
*Yövmül-hesab* – Hesab günü, qiyamət günü

**Z**

*Zağ* – Qarğa
*Zəban* – Dil
*Zəhi* – Afərin
*Zəxm* – Yara
*Zəmir* – Ürək, can
*Zənbur* – Arı
*Zər* – Qızıl
*Zərd* – Sarı
*Zərq* – Hiylə, yaltaqlıq
*Zərraq* – Yaltaq, riyakar
*Ziba* – Gözəl
*Zikr* – Xatırlama, söyləmə
*Zində* – Diri
*Zişt* – Çirkin
*Ziya* – Parıltı
*Zöhd* – Asketizm
*Zübdə* – Qaymaq, cövhər
*Zünnar* – müsəlman dövlətlərində yaşayan xristianların bağladığı qurşaq

## MÜNDƏRİCAT



## QƏZƏLLƏR

Buraxılışa məsul: *Əziz Güləliyev*

Texniki redaktor: *Rövşən Ağayev*

Tərtibatçı-rəssam: *Nərgiz Əliyeva*

Kompyuter səhifələyicisi: *Ələkbər Kərimov*

Korrektorlar: *Elmira Teymurova*
*Pərinaz Səmədova*

Yığılmağa verilmişdir 08.07.2004. Çapa imzalanmışdır 26.11.2004.
Formatı 60x90 $^{1}/_{16}$. Fiziki çap vərəqi 21. Ofset çap üsulu.
Tirajı 25000. Sifariş 186.

Kitab "Şərq-Qərb" mətbəəsində çap olunmuşdur.
Bakı, Aşıq Ələsgər küç., 17.